# Molla Nəsrəddin



# ملاّ نصرالدّین

**Hazırladı: Cavid Ağa**

**حاضرلادی: جاوید آغا**

1909г. دوردجی ایل ۱۹۰۹

# ملانصرالدین

№1. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپیک ۱





1905-ci ildə Qafqaz iğtişaşında




İğtişaşdan sonra

Təzə il üçün abunə qiyməti
Qafqazda və Rusiyada:
12 aylığı (52 nüsxə) - 5 manat
9 aylığı (39 nüsxə) - 4 manat
6 aylığı (26 nüsxə) - 3 manat
3 aylığı (13 nüsxə) - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə
12 aylığı - 6 manat
6 aylığı - 4 manat
Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

E'LAN QİYMƏTİ

| E'lanın qədəri | Petit sətrinin qiyməti | | Bütün səhifənin qiyməti | |
|---|---|---|---|---|
| | qabaq səhifədə | dal səhifədə | qabaq səhifədə | dal səhifədə |
| Bir dəfə | 10 qəpik | 7 qəpik | 30 manat | 21 manat |
| 2 dəfədən - 13 dəfəyədək | 8 qəpik | 6 qəpik | 24 manat | 18 manat |
| 14 dəfədən 26 dəfəyədək | 7 qəpik | 5 qəpik | 21 manat | 15 manat |
| 27 dəfədən 52 dəfəyədək | 6 qəpik | 4 qəpik | 18 manat | 12 manat |

İdarəmiz Tiflisdə Davıdovski küçədə, nömrə 24.
Məktub və teleqraf adresi: Tiflis, "Molla Nəsrəddin".

**24 zilhiccə 1326, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 4 yanvar 1909**



## *MÖ'MİN*

Gər olam mö'min, dindar qiyamətmi qopar?
Qabiliyyət edəm izhar qiyamətmi qopar?
İtaət əhli olub guşənişin olmaq üçün,
Gər olam elmə tələbkar qiyamətmi qopar?
Geyərəm xirqeyi-pəşmin olaram xəlqə imam,
Gər qoyam başıma dəstar qiyamətmi qopar?
Oxuyub fiqhü üsuli neçə il zəhmətlə,
Olmuşam məxzəni-əsrar qiyamətmi qopar?
Bu nə sözdür ki, deyirsiz oxuyun doktor olun,
Mənə möhtac ola bimar qiyamətmi qopar?
Nə gərək elm oxuyub texnik olub şəpkə qoyam,
Olmasam boylə sənətkar qiyamətmi qopar?
Hey deyirsiz oxuyun, sonra Fitilbörkə gedin,
Etməsəm rus ilə rəftar qiyamətmi qopar?
Etmə tə'rif mühəndis nədi, doktor kimdir,
Olmasaz boylə dilazar qiyamətmi qopar?
Bəs məzəmmət elədiz elmi-üsuli, fiqhi,
Tərk ola sizdə bu göftar qiyamətmi qopar?
Şəhri-Qəzvini qoyub, Xütteyi-Parisə gedib,
Olmasaq səg kimi murdar qiyamətmi qopar?
Nolu Tehranda gedib elm oxuyub, rəml atsaq,
Eləsək cini giriftar qiyamətmi qopar?
Ya Xorasanə gedib kəsb qılam elmü ədəb,
Gər olam alimi-dindar qiyamətmi qopar?
"Mən təşəbbəhə biqövmin fəhüvə minhüm" bil,
Etmə sözsüz bunu inkar qiyamətmi qopar?
Rahət istərsən əgər sırf əvam olmaqdır,
Dəhr ola başımıza dar qiyamətmi qopar?

**Bir mö'min**







## MİYANƏ

Miyanə dediyimizdə qarelərin bir parasının xəyalına gələcək ki, xub miyanə, yə'ni ortalıq. Xeyr, Miyanə İranın Azərbaycan ilə Tehran arasında vaqe məşhur qədim bir şəhəridir. İki qitənin ortasında vaqe olduğuna cəhət adını qoyublar Miyanə, yə'ni ortalıq. Bu şəhərin mö'tədil havası, vəsi' və xoşayənd mənzərəsi vardır. Ələlxüsus, bu şəhərin çox arif, çox həlim və xoş adamları vardır ki, hər kəsin üzünə baxıb o saatda bilirlər ki, nə hörmətə layiqdir və nə karın sahibidir. Belə ki, Mirzə Həsən ağa (əstəğfürullah, Təbriz müctəhidi) Təbrizdən qaçan vaxt ki, istəyir Tehrana getsin, lazım olur ki, haman Miyanə şəhərinin içindən keçsin. Miyanə ürəfa və danişməndləri baxəbər olaraq o saatda fəhm edirlər bu cənab nə tövr adamdır. Binaən əleyh çünki ağa müsibətli və qüssəli sayılır və Təbriz acısı hənuz damağındadır, lazım bilirlər ki, ağanı şadyanalıq ilə pişvaz etsinlər. O saatda xəbər verirlər cəmi dünbək və balaban çalanlara, kəmali-ehtiram ilə ağanı pişvaz edirlər. Vaqeən də Miyanə camaatı çox arif adamlardır ki, hər kəsi öz şə'ninə layiq pişvaz edirlər.

**Hərdəmxəyal**

## SÖHBƏT

- Səlaməleyk, məşədi. Ay xudahafiz, xüdahafiz! Vallah, nə qədər istəyirdim səni görəm, mümkün edə bilmirdim, bu gün allahın mənə böyük iltifatı olubdur ki, səni gördüm.

- Əleykəssalam, Hacı, maşallah, sizi də görmək olarmış? Sənin canın üçün, heç bir dəqiqə də ürəyimdən çıxmıyıbsan. Mən də hey istəyirdim bir səni görəm.

- Məşədi, bilirsən ki, sənin üçün canımı tələf edənəm və hər nə qulluğun olsa hazıram.

- Vallah, Hacı, yaxşı oldu səni gördüm, bu günlər əhvalım xoş deyil.

- İnşallah, bir zad olmaz, allaha təvəkkül et. Buyur, gedək bir çay içək!

- Ay ağrın alım, həmd olsun, öz canım salamatdır, amma işlərim yaxşı deyil. Bu günlər bir az pul gərəkdir, allahın iltifatı oldu ki, səni gördüm.

- Dükana kəc qaldım, məni bağışlayın, məşədi, inşallah, genə görüşərik...

## ZƏNG

O vaxtdan ki biz "Qeyrət" mətbəəsində başlamışıq divar təqvimi çap eləməyə, bizə Bakı, Nuxa və Tiflis müəllimlərindən yüzdən artıq şikayət kağızı gəlib ki, nə səbəbə xaçpərəst bayramlarını biz qırmızı vərəq üstündə çap eləmirik.

Müəllimlərin də giley eləməyə haqları var, çünki bu yazıqlar həmişə gecə və gündüz intizardadırlar ki, kəlisa bayramları yetişsin və müsəlman uşaqlarını ötürüb, özləri də gəzib rahat olsunlar. Əlbəttə, əgər bu cür bayramlar qırmızı vərəq üstündə çap olunsalar, müəllimlər haman saat görərlər ki, bu gün bayramdır və uşaqları ötürərlər.

Buna bizim heç sözümüz yoxdur, amma müəllimlərə biz bir belə təklif eləmək istəyirik:

Xaçpərəst bayramının axşamından başlamış kəlisaların zəngi həmişə çalınar. Biz müəllimlərə məsləhət görürük ki, təqvimə möhtac olmasınlar və bizi də artıq xərcə salmasınlar. Həmişə kəlisanın zəngini eşidən kimi bilsinlər ki, sabah "prazdnik"dir və uşaqlara xəbər versinlər ki, dərsə gəlməsinlər.

Məsələn, indi Tiflisdə müfti və şeyxülislam məktəblərinin uşaqları iki həftədir ki, küçələrdə bazar halvası axtarırlar, çünki məktəblər bağlanıb. Yə'ni bu qaydanı hökumət qoymuyub və qoymazdı da. Nökumət bir belə insafsız qərardadı eləməzdi ki, müsəlmanların ruhani məktəbləri xaçpərəst bayramlarını saxlasın və tə'til eləsinlər. Bu qaydanı müsəlman müəllimləri özləri qoyub.

Xülasə, bizə qalsa, təqvimin heç lüzumu yoxdur: elə kəlisanın zəngi çalınan kimi lazımdır bilmək ki, sabah dərs yoxdur, vəssalam.

**Cırcırama**

## İDARƏDƏN

Hər kəs paket içində bizə pul göndərsə və pulu poçtxanada paketin içindən çıxartmış olsalar idarəmiz cavabdeh deyil.

## ƏDƏBİYYAT

**(Şahnamə)**

Şəhim, tacidarım,
qəvi-şövkətim,
Mələk-ehtişamlım
fələk-rüf'ətim!
Əgər lütflə sorsan əhvalımı,
Bu naməm sənə bildirir halımı:
O gün ki hüzurundan ətfi-ünan
Edib, suyi-Təbrizə oldum
rəvan.
Bu əzm ilə kim sif tək cəng
edəm,
Mücahidlərə ərsəni təng
edəm,
Fədailəri öldürəm xan ilə,
Biyanbanları dolduram qan ilə.
Rikabimdə bir tovsəni-badpa,
Açılmış başım üstə zərrin liva.
Yəminü yəsarimdə sərhənglər,
Nə sərhənglər?
Rüstəmi-cənglər!
Qoşun seyl tək rübərudə
rəvan,
Həşəm xeyl tək hər tərəfdən
dəvan.
Boyunlarda yeksər
qətari-fişəng,
Revolverlər əldə həmayil
tüfəng.
Çalınmaqda şeypurlar, naylər,
Ucalmaqda ləşkərdən urraylər,
Çəkilməkdə ərradədə tuplər,
Təbillərdə fəryadi-
gup-guplər...
Bəli, mən bu fərxəndə
iqbal ilə,
Bu şövkətlə, sətvətlə,
iclal ilə...

Ötüb qatladım yolların
az-çoxun,
Gəlib ta ki Təbrizə oldum
yoxun.
Buyurdum çalınsın neyü
kuslər,
Və getsin xəfi şəhrə casuslər.
Bu iş fikr edirdim ki,
bir dolmadı,
Ha mən söylədim, bir gedən
olmadı.
Gəlib qeyzə hökm eylədim
ləşkərə,
Açın şəhrə üç yandan od
bir kərə.
Açıldıqda ataş edərdin güman
Ki göydən yerə od yağır
nagəhan.
Fədailərin təngə düşdü işi,
Ölüb ordaca qaldı doqquz kişi.
Görüb çün bu övzai Səttarxan,
Urub şir tək nə'rə çəkdi
fəğan:
Mücahidlər! Ey qeyrətin
kanları!
Qənimət bilin boylə
meydanları.
Həyatın qalır bizdə son saəti,
Ağırdır bu son saətin qiymətı.
Nə bir xidmət etmişsəniz
millətə,
Bütün bəstədir işbu bir saətə.
Bu söz boylə tə'sir edib
ləşkərə,
Hamı canü dildən dedi
bir kərə:
Nə ölmək? Biz öldürməyə
hazirik,
Gər ölsək də bu əmrdə
şakirik.
Deyib bu sözü şəhrdən
çıxdılar,
Elə qızdılar: təhrdən çıxdılar.
Mücahidlərin cünbüşündən
haman,
Deyərdin ki, bir məhşər oldu
əyan.
Düşüb səcdəyə cümlə
ixlas ilə,
Niyaz etdilər niyyəti-xas ilə.
Durub bir sağa, bir sola
getdilər,
Qəfildən bizə bir hücum
etdilər.
Yəmini yəsarə qatıb urdular,
Bizi əzdilər, döydülər, qırdılar.
Dədəm vay! Məgər boylə də
cəng olur?
Hələ lap uzaqdan nəfəs
təng olur.
Xüsusən məgər boylə də xan
olur?
Bu sətvətlə də mərdi-meydan
olur?
Bu halı görüb xiyrələndi
gözüm,
Cəhənnəm qoşun! Ölmüş idim
özüm.
Dedim yaxşıdır bir dağa
dırmaşım,
Əlimdə səlamət qala ta başım.
Qaçıb mərdü mərdanə çıxdım
dağa,
Baxırdım o yerdən sola, həm
sağa.
Nə gördüm qaçır tülki - nisbət
qoşun,
Özün də görəydin gələrdi
xoşun.
Haray basdım ax, vay, aman
qaçmayın!
Davam eyləyin, bir zaman
qaçmayın!
Sözüm batmadı ləşkərin
beyninə,
Ox! Ox!.. Batdı ox Dövlətin
eyninə.
Qoşun qaçdı boşlandı
meydani-cəng,
Bütün getdi yəğmaya topü
tüfəng.
Çü gördüm olur vəz'i-halım
təbah,
Gətirdim iyirmi qazağa pənah.
Yanan qəlbimə sanki su
saçdılar,
O yerdən alıb da məni
qaçdılar.
Budur surəti-ərzi-halım
mənim,
Mücahidlər ilə cidalım mənim.
Qəvi-şövkətim! İndi fərman
nədir?
Buyur, hazıram, baş nədir,
can nədir?
Əgərçi qaçarkən atı
yormuşam,
Genə hər nə hökmün ola
durmuşam.

Yazıldı Eynüddövlə tərəfindən

**Nazimi Əbunəsr Şeybani**

## *GƏNCƏ*

1) Dekabrın iyirmi altısında cümə günü məktəbi-ruhaniyyədə "tövzii-mükafat" bəistilahi-rus "akt" oldu. Səhnədə köhnə məktəb üsulu göstərildi ("Qan ocağı"ndan bir pərdə): falaqqa, nar çubuqları, diz üstə yırğalana-yırğalana dərs oxumaq. Əhali köhnə məktəb üsulunun yaxşılığını və mənfəətini düşünüb çox xoşnud oldu; hazirundan Mirzə Sadığı əhsən-əhsən deyib alqışladı. Camaatın ürəyi elə yumşaldı ki, səhnədə şagirdlərin biri ərəbcə bir qit'ə oxuyanda hökür-bükür ağlamağa başladı. Yazıqlar elə güman elədilər ki, tə'ziyə məclisindədirlər; buna görə boylə qərar qoyuldu ki, genə köhnə ata-baba üsuluna qayıdılsın və bu il məktəbdən çıxmış iyirmi bir mərsiyəxan məhərrəm ayında bir neçə gün mərsiyə oxusunlar ki, Gəncənin maarif və mərsiyəxanpərvər əhalisi feyzdən məhrum olmasınlar. Mərsiyəxanlarımız diplomludurlar, özləri də iyirmi bir dənə, Qafqazın hər yerinə çatar. İmtahandan yaxşı çıxanları Naxçıvan, Bakı və Qubaya göndərəcəklər, qeyr şəhərlərə də istəmək olar.

2) Şəhər böyük bir həyəcana düşüb qırmızısaqqal, qarasaqqal hacı, kərbəlayı, məşədilər saqqallarını buluya-buluya söylüyürlər ki, Axund Pişnamazzadə lap "təzə müsəlman" olub, çünki nitqində dedi ki, həzərat, köhnə üsul ilə üsuli-cədidin təfavütünü görün, məktəbə kömək edin, nicatımız məktəbdədir... Hacılar boylə qərar qoydular ki, təzədən genə də "danosbazlığa" iqdam olunsun, çünki axundun sözlərindən və camaatdan kömək istəməyindən boylə anlaşıldı ki, niyyəti əhalini soymaqdır.

3) Ayın 24-də şəhərə böyük bir səs düşdü. Hamı bir-birinə dəydi, iranlılar konsul təvəssütü ilə qubernatora asi oldular... İxtişaşa səbəb genə bir "intelligent" olmuş, mərdimazar doktor Ağayev bir pristav da götürüb

düşdü çayçı dükanlarının canına ki, nə var, nə var, mən tiryək və tiryək çəkənləri axtarıram, gərək bu tiryəkxanaları bağlıyam və qoymuyam ki, gəncəlilər də iranlılar kimi tərəqqi edib tiryəkə adət eləsinlər... Yazıq doktor elə bilir ki, Xanlıq karvansarayından bir də daş qastindən beş hoqqa (tiryək çubuğu) ilə, bir girvənkə tiryək tutmaq ilə bizə bir şey eliyə biləcək; zərəri yoxdu, qoy bu iki tiryəkxana bağlansın, o biri çayçıxanalarda çəkərik; mərdimazarlıq doktorun özünə qalar... Camaatı özündən razı eləməkdən isə daha da narazı eliyir... Yazıq çayçıların ruzilərini kəsir... Beş-altı müsəlmanı çörəkdən salır... Axı bu yazıqlar da tiryək satmaq ilə dolanırlar... Bu da bizim müsəlman doktoru... Nə deyim... Allah özü imanını dürüst eləsin...

**Bir nəfər hacı**

## MƏTBUAT

**"Vətq" yazır:**

Səmərqənddə "Bolğur" səhrasında rus kəndləri salınacaq.

Bu səhrada kanallar qazıb Zərəfşan nəhrindən su gətirib suluyacaqlar. Bunun məsarifi Buxara hökuməti ilə sart müsəlmanlarının kisəsindən çıxacaqdır.

**MOLLA NƏSRƏDDİN**

Pruşkeviçlərin mədəniyyəti bundan artıq ola bilməz. Bununla belə, bütün ömürlərini həcc yolunda, mütrübbazlıqda keçirən bir hökumət, bir millət barəsində belə şeylər təəccüblü deyil.

.......

"Nicat" cəmiyyətinə ərizə verənlər gecə kurslarına zərər vurduqlarından ötrü məhkəməyə şikayət olunacaq.

**MOLLA NƏSRƏDDİN**

Şəkk yox, sudya "Nicat"dan soruşacaq ki, oxumağa ərizə verənlərin müsəlman olduqlarını bilirdiniz, ya yox? Əlbət, deyəcəklər ki, - bəli! O halda sudya şikayəti kifayətsiz qoyacaq.

Biz də məsləhət görürük ki, nicatçılar nahaq yerə özlərinə zəhmət verib iki dəfə zərər çəkməsinlər.

**"VƏQT" YAZIR**

Osmanlı millət məclisinə Anadoludan qoca, yumuşaq vəkillər gəldi. Bunların içində zəmanədən bixəbər pək çox cahil mollalar da var.

**MOLLA NƏSRƏDDİN**

Ya bu xəbər yalandır və ya soltanın öz nitqində dediyi "32 il əvvəl millət məşrutəyə hazır olmadığı üçün birinci məclisi dağıtdım və ondan bu yana camaatı məşrutəyə (?) hazırladım, indi hazır görüb məclisi genə açdım" sözləri yalan olmalıdır.

**İSTANBULDA ÇIXAN "TƏNİN" YAZIR:**

Sultan öz nitqində deyib: qanuni-əsasiyi saxlayacağıma söz verirəm.

**MOLLA NƏSRƏDDİN**

Bu sözlər 32 il əvvəl də verilmişdi, Məhəmmədəli şah da üç dəfə Qur'ana and içib.

Aciz və çarəsiz vaxtlarda söylənən bu kimi söz və andların başa yasdıq qoymaqdan özgə bir şey olmadığını tarix bizə göstərdi.

Doğru söz budur ki, genə osmanlı şairi deyir:

Osmanlılar bu gün oldu
müzəffər,
Fəth etdi yenidən vətəni
əsgər.
Açdı məb'uslara yolu
süngülər,
Yaşasın Niyazi, yaşasın Ənvər!

## KƏFƏN

Hər kəs istəyir ki, cümə günü alış-veriş eləsin və müsəlmanların töhmətindən qurtarsın - mən ona bir "fənd" öyrədim. Bir gün Lənkəranda Hacı Həsən adlı bir tacir cümə axşamı bir nəfəri öyrədir ki, "sabah gəl məndən kəfən istə və de ki, ölümüz ölüb". Cümə günü həman şəxs gəlib kəfən istəyir və çünki kəfən istəyəni rədd etmək olmaz. Hacı Həsən dükanı açıb bir qədər kəfənlik ağ kəsib verir alıcıya və deyir ki, "əyləş, sidri-kafur üçün uşaq göndərim". Uşaq gedib iki saat gəlmir və o gəlincə Hacı Həsənin dükanı iki saat açıq qalır və bu iki saatda hacı müştərilərə yüz manatlıq şey satır. Hər kəs istəyir ki, cümə günü alış-veriş eləsin, Hacı Həsən kimi eləsin. And içə bilərəm Pirverdinin gopuna ki, heç bir nəfər də bədgüman olmaz.

**Qızdırmalı**

## POÇTA QUTUSU

Batumda "Sarsağ"a: Məsləhət olmadı.

Qubada "Məşədi Furuş-qulu"ya: Məsləhət olmadı.

Novobayazitdə müxbirimizə: Məzrə kəndində bir cavanın barəsində yazdığınız sözlər çap olunmalı mətləb deyil.

"Gözətçi"yə: Gözümüz ilə görməsək və qulağımız ilə eşitməsək, o cür töhmətli sözləri axundun barəsində yaza bilmənik.

Kürdəmirdə qəzetə maraqlısına: Keçəllər barəsində yazdığınız mülahizə düz deyil. Biz öz cavabımızı sora verəcəyik.

## NAXÇIVAN

Hər kəs bundan sora Səttarxanın adını çəksə, onu tə'riflәsə və ona kömək çıxsa, mən yerinə mə'lum edərəm.

**Danabaş kəndinin əmmaməli jandarması Hacı Molla Ələsgər**

## NƏSİHƏTİ-HÜKƏMA

**(Şe'rnən)**

Molla əmi, sən allah, -
bu şe'rimi çap elə,
Eyləməsən bunu bil -
səni tutub aparram.
Səadət uşkoluna -
qataram tənbeh otağına.

**Əvvəlinci nəsihət:**

Əgər azarlı olsan,
Ye ənciri, üzümü.
Özünü də ver yelə,
Bir-iki gün səbir elə.
Oyan-buyan olarsan,
İgid oğlan olarsan,
Nəinki həkim belə gəldi,
Dava-dərman belə getdi.

**İkinci nəsihət:**

Əgər ki yel əsməsə,
Əlac lap asandır.
Boz qatırı tutgilən,
Yalın bir az qırxgilən.
Sora söyüd ağacın
Üç dəfə tərpətgilən.
Əgər külək əsməsə,
Onda belə degilən:
Anamın ilkiyəm mən,
Qaraca tülküyəm mən,
Şimal yeli əsməsə,
Evini yıxacağam mən.
Bir neçə gün belə eləsən,
əlbəttə, yel əsər.
(Mabə'di var)

**Dərdmənd**

## NİKİR-MİNKİR

Cəmi qəzetə oxuyanları əvvəl qəbrə qoyanda nikir-minkir gələcək ölənin yanına və deyəcək: "Yaz". Ölü deyəcək: "Nə yazım?" Nikirin deyəcəklər: "Nə qədər qəzetə oxumusan?" Ölü deyəcək: "Qələm və mürəkkəb yoxdur". Nikirin deyəcək: "Barmaqların qələm və ağzının suyu mürəkkəb, gərək tamam oxuduqlarını yazasan".

**Xasayurt mollası Şeyx Ne'mətulla axund**

## TAPMACA

Yumruqdur e'tiqadım,
Xəlqi basıb fəsadım,
Hazır durub cəlladım,
Zülmü sitəm muradım,
Hər yerdə vardır adım.

**Tapın görək kimdir bu adam.**

## VYANADAN MƏKTUB (50-ci nömrədən sora)

Odur ki, mən də Türkistan yolu gəlib Səmərqənddə düşüb (əz rahi-rəiyyətpərvəri) bir nəfər rəiyyətimizin evində düşdüm. Gecə keçdi, sabah bir də gördüm bir paket kəmali-ədəblə mənə verildi. Açıb nə gördüm: Lailahə illəllah! Kaş kor olaydım bu ləfzi oxumuyaydım; gördüm başda yazılıb "Təzə məktəb!! Siz də bura bir qədər ianə mərhəmət edin". And olsun Qasım bəy məscidinin azançısının canına, gözlərimdən od parıldadı. İlanın zəhləsi yarpızdan gedər, o da gəlib ilanın gözünün qabağında bitər. Biz bu cür ləfzlərin əlindən başımızı götürüb qaçırıq, burada da əl çəkmirlər. Səmərqənd şəhəri kimi bir qəflət dəryasında da "elm", "məktəb" ləfzləri var imiş. Allahü əkbər, pərvərdigara, bular nə naxoşluqdur milləti bürüyüb? Allah, özün də bizə rəhm qıl. Qərəz, kağız gətirəni bir dil ilə əkdim ki, inşallah, sabah təqdim edərəm. O ki o yana döndü, fürsəti fot eləməz heç xan məgər nadan ola, forən göndərdim neçə fayton gətirdilər. Heç bilmədik ki, çul-palasımızı necə yığışdırdıq, dolduq faytonlara, asda qaçana Şeyx Ne'mətullah qənim olsun.

Axı sizdən soruşuram, cənab axund Molla Nəsrəddin, mən bulara ianə nə verəydim? Bir balaca mücri firuzə daş-qaş idi, bir 20 və 30 min manat da bəratibangdı ki, o da olmazdı. Bir üçdörd min manat da ki xırda xərclikdi. O da ki olmazdı. Dəxi mən ianədi, nə zəhrimardı hardan verəcəkdim? Hamı 30 qəpik xırda pulum var idi ki, onu da qonaqçının nökərinə ən'am verdim. Füzullar nə qəbahətlərin anlıyırlar, nə xalqın şanü vəhşiyyətin mülahizə edirlər: məktəb, ianə, filan. Qərəz, qibleyi-aləmin dövlətindən, sizin mərhəmətinizdən səlamət çatdıq vağzala, bir tövrlə tələm-tələsik biletə iştenpel vurdurub yola düşdük. Acığımdan ev sahibinə xudahafis də etmədim. Xəyalım Daşkənd, Orenburq, Moskvada hərəsində düşüb bir neçə gün qalmaq idi, amma vilayətə kimi heç dalıma da baxmadım. Xəyal elədim ki, bir şəhərdə düşdüm, bəlkə orada da bir paket itələdilər biləyimizə. Qərəz, cin bismillah adı eşidən kimi kağızın başındakı "təzə məktəb ianə" ləfzi burada da yadıma düşəndə də dirim-dirim əsirəm.

**İmza: Məkkə adı ilə Firəngistana qaçan xani-vəziri-ticarəti-sabiqi - İran**

## E'LANLAR

**Divar təqvimi**

Tiflisdə mətbəədə 30 qəpik, özgə şəhərlərdə poçt xərci ilə 40 qəpik.

Kardonun üstündə Rusiya müsəlmanlarının halı gözəl bir surətdə təsvir olunduqdan özgə kənarlarında Osmanlı məclisinin rəisi Əhməd Rza, prins Səbahəddin, Osmanlı hürriyyət qəhrəmanlarından Niyazi və Ənvər bəylərin şəkilləri vardır.

Mərhum Cahangirxanla Məlikülmütəkəlliminin şəkilləri bizdən asılmıyan səbəblərə görə heyif ki olmadı.

---

Ştrixerin diş müalicəxanası, Erivanskaya ploşad, Puşkin küçəsi tərəfindən.

Эриванская площадь, съ стороны Пушкинск.ул.

Dişləri doldurur qızıl ilə, farfor ilə və qeyr. Kauçukdan və qızıl-

dan diş qayırır. Ağrısız diş çıxardır. Müalicəxanada məxsusi cərrah var. Naxoşlar qəbul olunur saat 9-dan axşam saat 7-dək. Qiymətlər taksa ilədir.

---

## *E'LAN*

"Molla Nəsrəddin"in əvvəlinci ilinin cildlənmiş kitablarından bir neçə ədəd hazırdır. Qiyməti idarəmizdə 6 manat, poçta xərci ilə 6 manat 50 qəpikdir.

---

## *"KİTABÜL-BƏYAN"*

**"Fitəfsirül-Qur'an"**

Bu ad ilə tərcümeyi-Qur'ani-şərifin əvvəlinci cildi (15 cüz) 492 səhifədə çap olub, talib olanlara göndərilir və bundan sonra 16 səhifə çap olduqca göndəriləcəkdir. İştirak haqqı Tiflisdə 3 manat 50 qəpik, başqa şəhərlərə göndərmək xərci biz ilə 4 manat 25 qəpikdir, mücəllid 40 qəpik ziyadədir.

On cild alanlara bir cild hədiyyə olunur.

Адрес: Тифлисъ 6 уч. фабричн. тупикъ с.д. № 2 Ахундъ М.Г. Мовла-заде.

---

Tiflisdə "Qeyrət" mətbəəsində çap olundu.

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə.

1865 г. 1870 г. 1882 г. 1896 г.

Rus və Amerika rezin manufakturasının şirkəti
Firması "TRİUQOLNİK"
(yə'ni Üçguşəli)
Peterburqda
Karxana şeyləri.
Çəkən rezin qayışları.
Rezindən və pinkadan qayrılmış qollar.
Azbestdən kartoni şeylər.
Cərrah və təbabət şeyləri.
Örtüklər və paltolar.
Rezinlənmiş parçalar.
Velosiped şinləri və hissələri.
Rezin oyuncaqları.
Toplar.
Rezin naboykaları.
Qaloşlar.
Hər qisim rezin şeyləri
və "buynuz" rezinindən qayrılmış şeylər.

1860
Т.Р.А.Р.М.
С. ПЕТЕРБУРГЪ

Təvəqqə edirik hər bir sifarişləri göndərmək

**"LEOPOLD NEYŞELLERİN"**

ticarətxanasına.

въ торговый домъ

"ЛЕОПОЛЬДЪ НЕЙШЕЛЛЕРЪ"

Тифлисъ. Эриванская площ., домъ Кредитнаго Общества.

Tiflis. İrəvanskaya ploşad, Kreditnaya Obşestvanın evində.

Xahiş edənlərə preyskurant tə'xirsiz göndərilir.

ПРЕЙСЪ-КУРАНТЫ ПО ПЕРВОМУ ТРЕБОВАНИЮ ВЫСЫЛАЮТСЯ БЕЗПЛАТНО.

# МОЛЛА НАСРЕДДИНЪ

**4 января 1909 г.** (четвертый годъ) **№ 1**


Подписная цена

Въ пределахъ России:

На годъ .....................5 руб.

1/2 года ....................3 руб.

3 месяца ..................1 р. 60 к.

За границу

На годъ .................. 6 руб.

1/2 года ................ 4 руб.

Плата за объявления

| Количество объявлений | Стоимость строки петита | | Стоимость целой страницы | |
|---|---|---|---|---|
| | впереди текста | после текста | впереди текста | после текста |
| Один разъ | 10 коп. | 7 коп. | 30 руб. | 21 руб. |
| отъ 2-хъ до 13-ти разъ или 1/4 года | 8 коп. | 6 коп. | 24 руб. | 18 руб. |
| отъ 14-ти до 26 разъ или 1/2 года | 7 коп. | 5 коп. | 21 руб. | 15 руб. |
| отъ 27-ми до 52-хъ разъ или целый годъ | 6 коп. | 4 коп. | 18 руб. | 12 руб. |

Редакция помещается на Давидовской ул., д.№24. Адресъ для писемъ и телеграммъ: Тифлисъ, "Молла Насреддинъ".




Biz oxumaq istəyən iki yüz müsəlman "Nicat" cəmiyyətindən təvəqqə edirik ki, bizə tezliknən gecə kursları açılsın və hamı xərcləri boynumuza çəkirik.

- A balam! İki yüzdən elə bir cüt, bir tək?..

ایندی .




Pruşkeviç: Sədaqətli Qafqaz müsəlmanlarını biz gərək çox istəyək...
(Allah bədnəzərdən saxlasın)

اول لرده .

СУВОРИНЪ

О.И.ШЛИНГ

Xain müsəlmanları bərk sıxmalı ki, Osmanlının

1909г. دوررجی ایل ۱۹۰۹

# ملا نصرالدین

№2. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپک ۲




Qoymarıq qabağa gedəsən.

Литог. С. Быховa



Bala, durma get işləməyə. (Şəkidə)




Bərəkallah, oğlan, burda genə gündə on qəpik qazanarsan: məktəbdə nə var?

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**
**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**1 məhərrəm 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 11 yanvar 1909**



**"NECƏ QAN AĞLAMASIN DAŞ BU GÜN,
QIRXILIR GÖR NEÇƏ MİN BAŞ BU GÜN"**

Bəli, başlar başlıyıblar qırxılmağa. Dəllək dükanlarında ma-cal yoxdur. Aşura günü iki yüz yetmiş milyon baş yarılacaq.

Və lakin bunlar hamısı köh-nə sözlərdir. Amma burada bir mətləb var ki, bəlkə oxucuları-mız onu eşitməmiş ola. Bu barə-də lazım bilirik bir az danışaq.

Yer üzündə qəribə bir əhva-lat baş verəndə Avropanın fənni cəmiyyətləri çox xərclər çəkib adamlar göndərirlər ki, təzə vüquatı elm və fənn tərəfindən öyrənsin və sora cəmiyyətə ərz eləsin.

Beləliknən, Avropada elm və fənn tərəqqi eliyib.

Məsələn, Amerikanın filan şəhərində gün təmamən tutulacaq. Qabaqca haman şəhərə hər məmləkətin coğrafiya cəmiyyətlərindən dəstə-dəstə alimlər göndərilir ki, günün tutulmaq sirlərini dəxi də yaxşı öyrənsin-lər. Məsələn, İtaliyada misli ol-muyan zəlzələ üz verib. Həm-çinin genə alimlər oraya dolu-şurlar ki, zəlzələnin hikmətlərini mümkün qədər öyrənsinlər.

Aşura işlərimiz avropalıların nəzərində elə bir qəribə və əhəmiyyətli əhvalatdır ki, bu barədə onlar indiyədək neçə cild kitablar yazıblar. İranın və Qafqazın böyük müsəlman şəhərlərində məhərrəmlikdə Avropa cəmiyyətlərinin üzvləri həmişə piş əz-vəqt hazır olarlar və aşu-ra günü qələmi və kağızı cib-lərinə qoyub çıxarlar uca divarın üstünə və tamaşa eliyib eşitdik-lərini təfsilən yazarlar və gör-düklərinin fotoqrafiyaya əkslərini götürüb aparərlar.

Bu qisim səyyahların biri dünən gəlmişdi idarəmizə. Bu cənab Lissabon şəhərində bir cəmiyyətin üzvüdür. Onun bu il Qafqaza gəlməyindən qəsdi üç mətləb öyrənməkdir.







Əvvələn: əgər baş yarmaq şər'ən lazımdır, nə səbəbə başlarını yaranların içində indiyədək bircə əmmaməli molla görsənmiyib.

İkinci: həmişə vaxtlarını qumar və çaxır məclislərində keçirən müsəlman "intelligentləri" nə qəsd ilə aşura günü dəstə qabağına düşüb baş yaranların qanlarını dəsmalları ilə silirlər?

Və üçüncü: səbəb nədir ki, baş yaranların hamısı ibarətdir məhz gəda-güdalardan, baqqallardan və çaqqallardan və bunların içində bir nəfər də maarif əhli görsənmir?

Biz bu suallara cavab verə bilmədik və qonağımız çıxıb getdi. Bu heyndə qulağımıza hatifdən bu səslər gəldi:

Bu günlərdə İranda istibdad ilə ədalət bərk çarpışır, yekə bir millətin dini, namusu, hüququ, vətəni təhlükədədir.Köməksizlik ucundan ola bilər ədalət tərəfi basılsın. Ol vaxt milyonlarca məzlumun dadü fəryadı bugündən artıq göylərə qalxacaqdır. Bir udum suya həsrət qalıb can verən balaların, qarınları yırtılan ana-bacıların halı Kərbəla vəq'əsindən aşağa qalmayacaqdır!

Bu gün Kərbəla meydanı Azərbaycandakı vətənpərvərlik meydanıdır. Hər kimin ürəyində bir cüzi din, namus, vətən hissi varsa, oranın qeydinə qalmalıdır. Axıtmalı qanlarımız, ehsan etməli pullarımız varsa, gözümüzün qabağında ürəklər parçalıyan Azərbaycan matəmgahı durur.

Bu gün ən böyük ibadət, ən birinci din və vətənpərvərlik oraya kömək etməkdir ki, həm Allah, həm də həzrət Hüseyn razı qalsın. Yoxsa Tiflisin, Bakının küçələrində qışqıra-qışqıra gəzib yalançıqdan başımızı cızıb bir az qan axıtmaq Hüseyn övladına və Rüstəm nəslinə yaraşan igidlik deyildir.

Bu gün Kərbəla meydanı Azərbaycan meydanıdır.

**Molla Nəsrəddin**

## SƏKKİZ MİSQAL

Neçə gün bundan qabaq Ağdam bazarında durmuşdum. Gördüm ki, bir dilicanın içində iki molla gəlir ki, lap dilicanı doldurublar və camaat bunları görəndə qoyub qaçdılar. Dedim, ay canım, hara qaçırsınız; bunlar Şuşa şəhərinin lap zorba mollalarıdır. Gəlin gedək qulluqlarına salam verək. Biri dedi ki, mən getmirəm, çünki məni görəndə turac istəyir. O biri də dedi ki, havax məni görür nar istəyir, xülasə, yüzə kimi adamdan hər biri dedi ki, məndən filan zad istəyir. Xülasə, bu ruhani atalarımızı görəndə yəqin elədim ki, bunlar bu qış günündə millət işindən ötrü gəliblər. Öz-özümə çox şükür etdim ki, bizim də millət qeydinə qalan ağalarımız varmış. Onların gəlməklərindən xəyal elədim ki, ola bilər ki, onlar bu soyuqda gəliblər ki, camaatdan ianə yığıb küçələrdə ayaqyalın gəzən yetimlər üçün bir məktəb açsınlar. Mollalar da gəlib Ağdam bazarının yavuğunda Muradbəyli adında bir yerdə mənzil etdilər. Mən də bir adamdan soruşdum ki, ağalar bu soyuq gündə zəhmət çəkib nədən ötrü gəliblər? Dedi ki, kəbin kəsməkdən ötrü. Mən bu sözə inanmıyıb getdim ağaların qulluqlarına ki, görüm bu necə sözdür. Gördüm ki, məclis başdan-ayağa kimi adam ilə doludur. Mollalar da o qədər üşüyüblər ki, az qalıbdır ki, donsunlar. Birdən gördüm ki, neçə qara kəllə qənd gətirdilər. Hər birini bir mollanın qabağına qoydular və hər birinin əlinə də paket verdilər. Yəqin onun içində də pul var idi. Mollalar qəndi qabaqlarında və paketi görəndə əvvəlcə bir gərnəşdilər. Sonra da bir-birinin üzünə baxıb bir gülümsündülər. Xülasə, məclisin o tərəf - bu tərəfinə baxıb öz ürəyimdə oradakı xərci hesab edirdim. Mənim hesabıma görə beş yüz manata kimi xərci olardı. İndi, ay Molla əmi, burada neçə məsələ var, onları qana bilmirəm. Mən yazım, sən də oxu: birinci məsələ budur ki, Ağdamda və ətrafında on beşə kimi molla ola-ola Şuşa şəhərinin lap zorba mollalarının bu soyuqda sitildiyə-sitildiyə bu otuz-qırx verst yolu gəlməkdən mənzurları nə imiş və halonki bildir neçə nəfər zəhmət çəkib Şuşa şəhərində fəqir və yetim uşaqlar üçün bir məktəb bina etmişdilər və küçələrdə bikar gəzib dilənçilik edən yetimləri orada oxudurdular və bu qışda və boranda qırx verst yol gedən mollalar ilə də o məktəbin arası ancaq otuz qədəm olardı. Bununla belə, o millət ataları bircə dəfə də olsa gedib oradakı yetim balaların hallarını soruşmadılar. Çünki orada qara kəllə qənd yox idi. İkinci məsələ budur ki, indiki ağalar zəhmət çəkib gəliblər, niyə bircə dəfə də olsa məclis sahiblərinə və qeyrlərə demədilər ki, bu beş yüz manatı nahaq yerə xərc edibsiniz, bunun nə dünyada sizə faydası var, nə də ki, axirətdə. Yaxşı olar ki, nahaq yerə xərc olunan bu cür minlərcə manatı yığıb yoxsul uşaqları oxudasınız və onlara tərbiyət verəsiniz, tainki onlar böyüyəndə sizin tayalarınıza od vurmasınlar və bağlarınızı qırmasınlar və atlarınızın və öküzlərinizin quyruqlarını kəsməsinlər. Üçüncü məsələ budur ki, belə hesab edək ki, kəllə qənd qoymur ki, mollalar bu sözləri desinlər, bəs camaat niyə başa düşmürlər ki, bu gözəl pullar xərc olub gedir və mollalar da cibişdan məsələsindən ötrü ağızlarını ianə şamı ilə möhürlüyüblər. Belə olanda camaat gərək özləri bu pulları yığıb lazım olan yerində sərf eləsinlər. Və bir də burasını da biləsən ki, mollalar haman şirni məclisində aldıqları qəndləri Ağdam bazarında dükan-dükan gəzdirib satdılar, onun da pulunu paketdəki pulun üstünə qoydular ki, yolda soyuq onlara əsər eləməsin və qəndləri satanda da birinin qəndi o biri mollanınkından səkkiz misqal əskik gəlmişdi, ona görə də ev sahibindən giley edirdi ki, mənə qəndin balacasını veribdir. Çox ola bilər ki, suda şikayət etsin.

**Kəşkül**

## DUA

A molla əmi, axı bəndə bir əngələ düşmüşəm, çünki bə'zi vaxtlarda gahdan bir ittifaq düşürdü Məzrə əhllərindən mənim yanıma gəlirlər idi siğə oxutsunlar və deyirdilər ki, qızın və oğlanın başlarında ağrısı var, siğə oxuyan zaman ağrını da kəs. Mən də bunların sözlərini zarafat hesab edib deyirdim ki, elə şey yoxdur.

Bəs demə ki, var imiş: Hüseynqulu ağa prixod mollası Molla Əhməd Cənnətzadə haman duanı bilirmiş. İş belə olan surətdə camaat məndən nifrət edib yığıldılar Molla Əhmədin başına, dahi heç kəs bəndəyə gəlib siğə oxutmurlar. Qalmışam labüd, laəlac və bu barədə camaatı da qınamaq yoxdur, çünki mən başağrısı kəsmək bilmirəm, hərçi Molla Əhmədə təvəqqə edirəm, paxıllıq edib öyrətmir. İndi əlac qalıb siz cənablara, bəlkə bir elə dua bilən molla yeri biləsiz, mənə nişan verəsiz gedib haman duanı örgənəm. Vəssalam.

İdarədən: yazarıq Hacı İsa Əfəndiyə, sizə o duayı öyrətsin.

## NAHAR

Məktəbin hər bir yaxşılığı qalsın kənarda, amma alış-verişə çox mənfəəti var.

Məsələn, Ağdaşda nə qədər məktəb ki yox idi - yazıq dükançılar məəttəl qalmışdılar. Amma indi allaha şükür, yaxşıdır, o da məktəbin bərəkətindən: müdir cənabları günorta vaxtı şagirdləri buraxır evlərinə ki, nahar eliyib genə gəlsinlər məktəbə. Söz yox, bunların əllisinin evi yaxın olur, gedir evdə çörək yeməyə, amma yüz əllisi doluşur bazara. Əvvəl çayçı dükanlarında çay içib, sora girirlər baqqal dükanlarına və qatıq çörək yeyib doyandan sora düşürlər bazarın canına: bir -iki saat qapaz-qapaz oynuyandan sora və "dərdmənd" baqqallarnan zarafat eliyəndən sora gedirlər məktəbə və orada, maşallah, axşama kimi genə dərsə məşğul olurlar.

## POÇTA QUTUSU

Ağdaşda "Bir şagird"ə: Darülirfan (barədə) çox yazsaq, şoru çıxar.

Bakıda "Bir müsəlman"a: Məhərrəmlik barəsində yazdıqlarınız doğrudur. Gələcəkdə bu barədə söhbət edərik. Qızınızı oxutmaqda görükür ki, bizim dostlarımızdansınız: yaşasın balaca qızınız!

İrəvanda "Zəli"yə: Yazdıqlarınıza inanmırıq və bu cəhətdən çap eləmiyəcəyik. Amma and içsəniz inanarıq; məsələn, and içsəniz, Nuxada Nurəddin əfəndinin müridlərinin çomaqlarına və haman cənabın maarif ba-rəsində çəkdiyi zəhmətlərə və söylədiyi nitqlərə.

Danabaş kəndində mollaya: Əməl olunar, amma siz də hərdənbir yazınız Baş Noraşendə "T.R." cənablarına və Axtıda "R.R." cənablarına. Keçəllər barəsində yazdığınız düz deyil.

## E'LAN

Qafqaziyanın hər nöqtəsində hər bir cür tüfəng və tapança gəzdirmək üçün qradanaçalnik divanxanasından şəhadətnamə alıram. Hər bir şəhadətnamənin qiyməti əlli manatdır. Xahiş edən zəvati-giram bu adresə rücu edəcəklər: ev nömrə 9999.

## QABİLİYYƏT

Dünyada allah-taala üç qisim adam xəlq eliyib.

Bir qismi lap biqabiliyyətlərdir ki, heç bir şey əllərindən gəlmir.

Bir qismi də o cür adamlardır ki, ancaq onların qabiliyyəti alçaq bir şeydə və bir sənətdədir, məsələn, biri müəllimdir, incinərdır, biri dərvişdir, biri, məsələn, Molla Mirabutalıb kimi rəml atmaqdan savayı dəxi özgə bir iş bacarmaz.

Amma bir qisim adamlar var ki, onların qabiliyyəti hər bir şeyə çatır. Məsələn, götürək Daşkənd şəhərində Seyid Cavad ağa Kirmanini. Bunun elminin intəhası yoxdur və sənətinin sayı yoxdur, qoy mən bir-bir deyim, sən bar-

maqlarını yum. Canım sənə desin - ölü öləndə meyit namazı qılır, çayçı dükanında iki qumarbaz bir-biri ilə hesab üstündə dava salsalar, haman saat ağa orada hazır olub onların arasına sülh qoyur. Canım sənə desin - şəhərə mütrüb dəstəsi gələndə onlara baş çəkir və şəhərdən razı yola salır. Birisi əncümənin üzvlərini söyəndə ağa rəncidə olur və deyir ki, günah üzvlərdə deyil, hürriyyətin binasını qoyandadır. Füqəraya pul yığılanda gərək pulları ağa özü paylıya və razı olmaz ki, o pullardan füqəraya heç olmasa bir hissə yetişməsin.

Qərəz, hələ sözüm çoxdur, amma qorxuram çox danışam, adımı qoyasan lağlağı.

**Lağlağı**

## ÇÖP

Mən balaca olan vaxt fikrimə gəlir bizim Qafar adında bir nökərimiz var idi. Ölənlərinizə allah rəhmət eləsin, bir gün mənim rəhmətlik babam nədən ötrü isə nökərimizi məscidə göndərmişdi. Nökər məscidə gedib görür ki, heç kəs yoxdur, fürsəti qənimət bilib yavaş-yavaş məscidin məhəlləsində olan gavalı ağacına çıxıb o qədər gavalı yeyir ki, bir vaxt bihuş halına gəlib yıxılır. Axşam bizə xəbər olur ki, nökərimiz bərk naxoşluyub. Dərhal babam adam göndərib cindar Molla Kazımı çağırtdı. Molla Kazım gələn kimi tas qurub başladı oxruc oxumağa. Xülasə, axırda mə'lum oldu ki, məzlum nökərin boğazında çöp qalıb. O saat Tamam xalanı gətirdib çox zəhmətlə çöpü çıxartdırdıq. Baxıb gördük məscid bağındakı gavalının çərdəyi ilişib nökərin boğazında qalıb. Hə, boğaz dedim, yadıma bir şey düşdü. Car bazarında olan məscidə nahiyə qazisi Molla Məhəmməd Seyidov neçə illər idi mollalıq edərdi. Sonra il keçdi, ay dolandı, gün doğdu, camaat rəhm edib məscidi Seyidovun əlindən aldı. Qoçaq Seyidov bizim nökər Qafar kimi bunların acığına məscidə vəqf olunan bir bab dükanı xəlvətcə yazdırır öz adına. Bir günü qəflətən Seyidov yerə yıxılıb başlıyır çabalamağa. Dərhal cindar uruh ölçən də'vət olunub Molla Məhəmmədin naxoşluğunu kəşf etməyə şüru edirlər. Axırda mə'lum olur ki, vəqf dükanı çöp olub qalıb bu yazıq Seyidovun boğazında. İndi, a Molla əmi, and verirəm səni Qoçana çayının kənarında olan bir nəfər çayçının imanına, dərhal bir qabil çöpçü tapıb göndərəsən bu məzlum Seyidovun çöpünü çıxardıb, onun vücudunu təhlükədən qurtarasız. Başağrısı oldu, əfv edəsiz.

**Sofi zənbil**

## ZƏLZƏLƏ

Bir məclisdə, üləmaların hüzuru olan yerdə İtaliya məmləkətində olan zəlzələ barəsində danışıq oldu. Axund Əliqulu bu zəlzələyə səbəb ora əhalisinin yoldan çıxıb xudayi-taalanı unutmalarından dolayı bər qəzəbi-ilahiyə giriftar olduqlarını bəyan etdi. Lakin şeyx cənabları buyurdular ki, xudayi-taala yeddinci yerin altında bir öküz xəlq edib ki, yer haman öküzün buynuzlarında qərar tutub ki, təfsilini "Siracəl-qülub" sahibi əleyhürrəhmə bəyan edib və həmçinin Molla Fətullah cənabları da n "vəlqələm" ayəsinin təfsirində zikr edir. Haman öküz ə'zasının hansı tərəfinə hərəkət versə, o vaxt zəlzələ olar və bir qeyr rəvayətə görə allah-taala bir mələk yaradıb və yerin damarları haman mələkin əlindədir, hər vaxt hökm edər ki, filan məmləkətin damarını çək, necə ki neçə il bundan əqdəm Şirvan əhalisinə bir belə bəla nazil etdi. İndi bu iki nöqtədən biri şəkkdən xali deyil. Yainki öküz ə'zasına hərəkət verib və yaxud mələk yerin damarını çəkib.

İndi biz məəttəl qalmışıq ki, bunların hansına inanaq; hər ikisi də mö'təbər üləmalarımızdandır. Oxuculardan təvəqqə edirik öz fikirlərini yazıb, bizi xatircəm etsinlər.

**Dindar**

## SUALLAR

Oxucularımızdan təvəqqə edirik ki, hər kəsin vaxtı müftədir, bu suallara cavab yazıb göndərsin idarəmizə. Amma paketin üstünə marka yapışdırmasın ki, kağız tez gəlib çatsın.

1) İki-üç il (əvvəl) Qafqazda neçə müsəlman qiraətxanası açılmışdı və indi bu saat neçəsi qalır?

2) Nuxa şəhərində hansı alimdir ki, buyurub: "Daha bundan sora müsəlmanlıq götürüldü, çünki Osmanlıda hökumət keçdi bir para oyunbazların əlinə".

## MƏTBUAT

"Tərcüman" son nüsxəsində yazır:"1905-6-7-8 tamam dörd il keçdi. Rusiyada bir çox hərəkətlər və təğyirlər görüldü. Bu hərəkət dövründə rusiyalı millətlərin çoxu bir-iki imtiyaz qazandı. Ermənilərin əlindən alınmış vəqfləri, milli məktəbləri öz təsərrüflərinə geri verildi; yəhudilərə bir xeyli müsaidələr edildi; əski din starover ruslara tamam hürriyyət verildi; polyaklara genə bir xeyli müsaidə göstərildi; Finlandiyaya əski imtiyazlar verildi. Kəndlilərə və işçilərə bir az yol verildi... Bu dörd ildə xüsusi olaraq müsəlmanlar nə qazandılar? Müsəlmanlar nə istədilər? Nəyə çalışdılar? Nəyə nail oldular? Olmadılarsa nə üçün olmadılar? Məsləksizlikdənmi, tədbirdə qüsurdanmı belə oldu?

Dili, qələmi, fikri və xidməti ilə camaat üçün çalışanlar 1909-cu ildə bu sualların həllinə hümmət buyursalar, faidəsiz olmazdı".

## *MOLLA NƏSRƏDDİN*

Nankorluq yaxşı sifət deyil. Millətimizin bu neçə zəhmət və xidmətini danmaq təcrübəli yazıçımıza yaraşmasa gərək. Hərçənd hey eşidirik ki, Molla Nəsrəddin niyə həmişə öz millətinin qüsurunu yazır, amma ermənilərin, firənglərin, ingilislərin əskikliklərini heç yazmır, - deyirlər. Amma bunları zarafat hesab edirik, çünki biz millətimizi illər uzunu mədh edib durmuşuq.

Bu dörd ildə müsəlmanlar çox şey qazandılar: müsəlman-erməni davası oldu, çox şəhərlər, kəndlər qazandıq. Hətta bu sayədə aclara yığılan puldan çox adamlar sərvət qazandılar.

Bu dörd ildə müsəlmanlar çox şey istədilər: istədilər ki, müsəlman qəzetələri arvad məsələsindən heç danışmasınlar və arvad cəmiyyəti bir yerdə baş verən kimi vurub dağıtsınlar. İstədilər ki, bir-iki qara, qırmızısaqqallı mollanın xatiri üçün yazıçılar təkfir edilsin, hamı üsuli-cədidçilərin ağızları bağlansın.

Bu dörd ildə çalışdıq ki, molla məhəmmədəminlərin, şamaxılı şeyx Həmid paşaların, qubalı molla Hacı babaların, ordubadlı mir mürtəzaların nüfuz və sərvətləri artsın.

Bu dörd ildə biz çox şeylərə nail olduq: seyid fabrikalarımız çoxaldı, İran konsullarının hümmətindən tiryək və mərizxanaların sanı artdı, Ağdaşda, Mərvdə hacı və axundların evlərində fəhişəxanalar açdıq.

Qafqazdakı iranlı, türk məktəblərində türk dilinə baykot elədik. Xülasə, nə istərsən bizdə olmadı; hə, az daha yaddan çıxaracaqdım, hamıdan ə'lası: Molla Abasqulu kimi möhtərəm və vüqarlı bir şəxs şeyxülislamımız oldu.

---

### VƏQT YAZIR

**Əlhani-eydi-səid**

Mütəcəllidir ki, hər ruz və ləyalında bütün asari kəmalatı tərcümani-ülviyyəti eyd əkbər, nazənin füyuzatı. Bax, bax! Nə möhtəşəm, gör nə qüdsi təcəliyyatı. İştə bu gün bizlər üçün əyyami-feyz və nicat.

**Ülumi-təbiiyyə müəllimi**
**Qazizadə**

**MOLLA NƏSRƏDDİN**

Pəh... pəh!.. Ülumi-təbiiyyə müəllimi".

Türkiyədən Avropaya qaçan İzzət paşa Türkiyəyə qayıtmaq üçün əsgər mənfəətinə cavan türklərə üç yüz əlli min manat verir.

**MOLLA NƏSRƏDDİN**

Hər şey əslinə qayıdar. Amma oğurladığının yanında puçuq az.

---

## *MƏNƏM*

Ey firqeyi-noməsləkan,
bir alimi-nadan mənəm.
İslamı cəhlə uğradan -
bir natiqi-kovdan mənəm!
Mən xəlqi də'vət eylərəm -
müştaqi-qəflət eylərəm,
Qərqi-cəhalət eylərəm -
bu rəzmdə aslan mənəm!
Zahirdə mən xud aliməm -
həm rəhnümayi-aləməm...
Batində leykən zaliməm -
hər iş tutan böhtan mənəm!
Qoymam sizi kam almağa -
elm öyrənib nam almağa,
Xəlqi sizə ram olmağa -
pul verməyən heyvan mənəm!
Kinü qərəzdir tinətim -
büxlü həsəddir fitrətim,
Var tazələrdən nifrətim -
xilqətdə çün şeytan mənəm!
Qoymam əvamı aldana -
dünyada ta var-yox qana;
Əhli-maarifdən yana -
min söz deyən böhtan mənəm!
Mən qanmaram xariç miləl -
dinə vurur hərdəm xələl,
Gəlməz əlimdən hər əməl -
ancaq baxan bican mənəm!

## *Kitab mağazası*

Mağazamızda məktəblərdə oxunan hər cür dərs və qiraət kitabları və böyüklərə məxsus nəf'li kitablar var.

Təbrizin axır hallarına məxsus gözəl rəngli xəritə 60 qəpik qiymətlə mağazamızda satılır.

Adres: Tiflis, kitabfürüş Hacı Ələsgər Məhəmmədzadə.

## *E'LAN*

1) "Hesab məsələsi" (**Задачникъ**). Bu kitab məktəblərdə və evlərdə hesab tə'limi üçün tərtib olunub 761 məsələsini, 237 tə'limatı-rəqəmiyyəyi və Rusiyada iste'mal olunan ölçüləri və ölçülərə dair tə'limləri havidir. Qiyməti 35 qəpikdir.

2) Gündəlik dərsləri yazmaq üçün yövmiyyə dəftəri (**Дневникъ**).

Şagirdlərə gündəlik, həftəlik, aylıq və illik nömrələr qoymaq və dərsləri yazmaq üçün cədvəlləri və bə'zi digər mə'lumatı havidir. Qiyməti 30 qəpik.

Bu kitabları almaq istəyən müəllimlərə və kitabçılara böyük təvafüt qoyulacaqdır. On ədəddən əskiyinə poçta markaları qəbul olunur. Xahiş edənlərə naloj ilə göndərilir.

Adres: Gəncədə Həmidbəy Yusifbəyova, yaxud məktəbi-ruhani kitabxanasına.

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə.

IV ГОДЪ ИЗДАНИЯ — № 2 — ЯНВАРЯ 11-ГО 1909г.

# "Молла Насрединъ"

*КОНТОРА и РЕДАКЦИЯ*
журнала
"Молла Насрединъ"
Тифлисъ
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

***ЦѢНА на ГОДЪ***
*Съ доставкою...............5 руб.*
*За границу....................6 руб.*
***ЦѢНА за ОБЪЯВЛЕНИЯ***
*За место занимаемое строкою петита впереди текста ......10 коп.*
*позади • • • .....7 коп.*

İmam: sındırın bu murdar cəmiyyəti - xeyriyyənin kruşkasını (İrkutsk şəhərində)




Verin pulları mənə, kruşkanı aparın, içinə beşlik doldurun.




Kazan şəhərində duma üzvləri

1909г. دوردنجی ایل ۱۹۰۹

# ملا نصرالدین

№3. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپیک ۳




Литог. С. Быхова



Petrovsk şəhərində çayçıxana

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
***Tiflis, Davıdov küçəsi, nömrə 24.***
***Тифлисъ, Давидовская ул., д.24.***

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**
**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**8 məhərrəm 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 18 yanvar 1909**

# Акционерное Общество "ГРАММОФОНЪ"

***Тифлисское отделение***
***Головинский проспектъ, № 9.***






QRAMOFON

Tiflis, Qalovinski küçədə, nömrə 9.

Burada göstərilən fabrika nişanəsinə lazımdır diqqət eləmək. Hər bir qramofonumuzun və qramofon hissələrinin üstündə bu nişanə var.

Danışan maşinaların heç bir fabrikasının ixtiyarı yoxdur öz maşinalarına qramofon adı qoysun, ondan ötrü ki, qramofon məhz bizim patentli maşinalarımızdan ibarətdir.

**Qramofon** ........ev üçün ən gözəl bir məşğuliyyətdir.

**Qramofon** ........oxuyur, çalır, gülür və qeyrə.

**Qramofon** ........vasitəsilə evdə sazanda və oynamaq məclisi qurmaq olur.

**Qramofon** ........dünyada əvvəlinci danışan maşinadır və həmişə əvvəlinci olacaq.

Bizim maşinaların tə'rifi: mexanizmi sadə, möhkəm, çox yaşayan, zahiri gözəl və hamıdan vacib - təbii səsləri öz halətində çıxardır.

Dekabrın birindən ikitərəfli plastinkalar başlanıb satılmağa: xırdaları 75 qəpik, "qrand" adlıları bir manat 50 qəpik hər biri.



Məsləhət görürük aşağıda ad verilən çalğıçı və sazandaların çalıb-oxumaqlarına heç olmasa imtahan üçün qulaq assınlar: Məcid, Seyid, Bağrat, Məhəmməd Xəlilov, Məhəmmədqulu şuşalı, Məşədi Qafar iranlı, Hilal. Xanımlardan: Varvara, Anna. Skripkaçılar: Arşak və Əmircan. Tarzən Ohanes (kamança), Sivi Mirzəqulu (kamança). Düdükçülər: Mirzəli Mirsadıqov. Zurnaçılar: Bağrat və Avetik və qeyrləri və qeyrləri.

Kataloqlar və siyahılar pulsuzdurlar!
Saxtalarından ehtiyatlı olunuz!

## ARZU

Nə dərs olaydı, nə məktəb, nə elmü sənət oleydi.
Nə dərsə, məktəbə, elmə, filana hacət oleydi.

Nə səndəli, nə qarandaş, nə lövhü miz, nə təbaşir,
Nə dəftərə, qələmə, kağıza bu rəğbət oleydi.

Nə mədrəsə, nə müəllim, nə bu üsuli-cədidə,
Və nə uşaqlarımızda bu qabiliyyət oleydi.

Nə əhlimizdə ayrılıq əlaməti görüneydi,
Nə bir para oxumuşlarda bu zəkavət oleydi.

Nə hiss oleydi cavanlarda əmri-millətə qarşı,
Nə bu cavanlar oleydi və nə bu millət oleydi.

Düşeydi daş o günə kim qazet-mazet sözü çıxdı,
Qazet işin törədən nabəkarə lə'nət oleydi.

Nə gündə, həftədə, ayda çıxan qazet və nə jurnal,
Nə mətbəə, nə mühərrir və nə təbaət oleydi.

Nə Şərq oleydi, nə əqsayi-Şərq, həm nə Japon,
Nə onların hünəri xəlqə dərsi-ibrət oleydi.

Nə nəfxi-"Sur"i Çahangir və nə Məlikülmütəkəllim,
Nə bə'zi kişvəri-İranda bu ləcacət oleydi.

Nə Türkiyədə bu qanuni-əsasi nəşr oluneydi,
Nə biəbəd yeni türklərdə bunca cür'ət oleydi.

Nə xortlıyaydı bu şəklilə Molla Nəsrəddin, ey kaş,
Nə kalba səbzalılarda bu xofü xəşiyyət oleydi.

O köhnələrdən əcəb kim utanmıyıb da deyirlər,
Gərək bu əsrə görə böylə-böylə adət oleydi.

Bu bişüurların əqlinə, kəmalına bax bir!
Qadam kəmalınıza, bari sizdə qeyrət oleydi.

**Duaguyi-millət Əbunəsr Şeybani**

## QƏNİMƏT

Amma bu zalim Orenburq tatarlarının içindən qəribə şairlər törüyüb. Məsələn, ayıb olmasın, "Din və məişət" jurnalının birinci nömrəsində "Sədiqül-əmini" imzası ilə bir şair yazır:

Əzimətsən, əzimətsən, əzimət,
Yaşa, ey möhtərəm "Din
və məişət".
Qənimətsən, qənimətsən,
qənimət,
Yaşa, ey möhtərəm "Din
və məişət".

Pəh, pəh, pəh, hələ bu cür şairləri görə-görə Hop-Hop da, Əbunəsr Şeybani də və Məşədi Sijimqulu da deyirlər ki, biz şairik.

Zarafat kənarda qalsın, amma "Din və məişət" jurnalı da doğrudan qənimətdir.

Həmin əvvəlinci nömrəsində teatr oynuyanlar barəsində jurnal bir doğru təkfirnamə yazıb deyir ki, müsəlman teatrçıları şəriətə xilaf olan teatr tamaşasını mö'min müsəlmanlar içinə gətirmək ilə allah bəndələrini yoldan çıxardırlar.

Əlbəttə, bu sözlər səhihdir və əlbəttə, bir belə yazıçı müsəlmanlar üçün qənimətdir. İndi dəxi bundan sora dağıstanlı fəzilətli Əlqədari cənabları və bunun kimi qeyr üləmamız çox da özlərindən deməsinlər, çox da qızlarımızın oxuyub müəllimə olmaqlarına çalışmasınlar, yoxsa mən "Din və məişət"in mollalarını çıxardaram onların müqabilinə, onda görüm nə cavab verəcəklər.

"Qənimətsən, qənimətsən,
qənimət,
Yaşa, ey möhtərəm "Din
və məişət".

Mən qorxuram bə'zi qəlbiqara cavanlarımız inanmıyalar ki, iyirminci əsrimizin içində "Din və məişət" kimi "falnamə"lərə Sədiqül-əmini kimi axmaqlar zəhmət çəkib belə uşaq oyuncağı mədhnamələr yazalar.

Amma dünyada hər bir şey ola bilər, xülasə:

"Qənimətsən, qənimətsən,
qənimət,
Yaşa, ey möhtərəm "Din
və məişət".
Əzimətsən, məzimətsən,
nəzimət,
Yaşa, ey möhtərəm cin
və qəmişət".

**Cırcırama**

## ƏMİRHACIYAN KƏNDİNDƏ

Əhməd - Axund, bu kağıza siz də qol qoyun.

Axund - Nədir o?

Əhməd - Bu məsləhətnamədir, yazdırmışıq ki, camaat mədaxilindən bizim hissəmizə düşən pul məktəbə sərf olunsun.

Axund - Rusca yazılıb, bəlkə özgə şeydir?

Əhməd - İnanmırsan bax, bu da bizim qolumuz.

Axund - Xeyr, murdar mürəkkəb ilə yazılan kağıza mən qol qoya bilmərəm.

## E'LAN

Alimi-məşhur Şeyx Rza cənablarının göy kitabı qaib olubdur. Tapıb görənə şeyx həzrətləri behiştdən göndərilmə sidri-kafiri və'də edir və bu tilsimi yazıb verəcək ki, o adama cin dəyməsin: Ş.İ.X.R.Z.A.

**Qarın**

## E'LAN

Mə'lumdur ki, Gürcüstan iğtişaşından sora gürcü camaatı artıq zülmlərə düçar oldu: bir çoxu vətənindən baş götürüb qaçdı, yerlər əkilmədi, alış-veriş kəsildi və axırda camaat çörəyə möhtac oldu.

Vəleykən biz müsəlmanların gürcü camaatını dost tutmağı gün kimi aşkardır. Və məhz bu babətdən biz özümüzü borclu bilirik Gürcüstan əhalisinə xəbər verək ki, işsiz qalan balaca uşaqları göndərsinlər, biz onları prikaşşik saxlıyaq: həmi uşaqlar özləri bir tikə çörək sahibi olsunlar, həmi atalarına az-çox xərclik göndərsinlər.

**Yevlax stansiyasında müsəlman tacirləri**

## POÇTA QUTUSU

Nuxada "Ə.Ə." zadəyə: Gəlin özbaşına deyil ki, çox danışsa, boynuna kəndir salıb genə aparıb tapşırarlar ərinə. Çox da gəlin çığır-bağır eliyir. Dağ nə qədər uca olsa, yol üstündən aşar. Allah atalarımıza rəhmət eləsin, bir qaydadır qoyublar, gərək əməl edək.

Gəncədə "bir cavan"a: Qorxursan ki, kağız düşə səbətə. Əgər çox qorxsan, Hacı Ələkbər oğlundan təvəqqə elərik ki, sənə bir dua yazsın.

Dərbənddə bir nəfər "Abid"ə: Yazmasaq olar.

## E'LAN

Qafqaz müsəlman Cəmiyyəti-xeyriyyəsinin ümumi məclisi əvvəlcə 18-nə tə'yin olunmuşdu. Lakin məhərrəmliyə görə həmin məclis yanvarın 30-na tə'xir edildi.

## TELEQRAF XƏBƏRLƏRİ

**Cəhənnəm** - Müctəhid Şeyx Fəzlullahın buraya təşrif etmək xəbəri hamı camaatı sevindirdi. Şücai Nizamın sərkərdəliyilə bir dəstə zəbani qoşunu qıl körpüsünün yanına getdi ki, şeyxi oradan istiqbal eləsinlər. Buradakı məhafildə danışılan xəbərlərə görə şeyxə, müctəhidliyinə hörmətən, "Veyl dərəsi"ndəki ən ali imarətlərin biri veriləcəkdir.

.......

**Şamaxı** - Dünən gecə imamlı tərəfində göyün açıldığını bir mö'min kişi görüb.

.......

**Culfa** - İrandan rus sərhəddinə on iki dəstə mərsiyəxan qoşunu keçdi. Ruslar qorxuya düşüb sərhəddi möhkəmləndirirlər.

.......

**İstanbul** - Buranın itləri mitinq qurub hökumətə şikayət elədilər ki, köhnə yoldaşları olan xəfiyyələri azad etsinlər, çünki onlar gedəndən bu yana bunlar ac-susuz qalmışlar.

.......

**Gəncə** - "İstiqbal"ın ikinci nömrü vaxtında çıxacaq.

.......

**Təbriz** - Eynüddövlənin beş günlük ultimatumunun vaxtı gələn ilin dekabr ayında tamam olacaq.

.......

**Bakı** - Buranın İran camaatı məhərrəmin birindən on ikisinə qədər əncüməni-xeyriyyədə yığışıb Azərbaycana kömək etmək məsləhəti bərpa edəcəklər. Danışılır ki, bu il məhərrəm ehsanlarını bərhəm edib onun pulunu Azərbaycan müsibətzədələrinə göndərsinlər.

.......

**Peterburq** - Pruşkeviç Qafqaz müsəlmanlarını çox artıq istədiyindən hökumət dairələrində çalışır ki, strajniklər müsəlmanları tüfəng arxası ilə döyməsinlər, heç olmasa yumşaq qamçı işlətsinlər.

.......

**Batum** - Acaranın mollaları həmd olsun, bir "İttifaqi-üləma cəmiyyəti" təşkil etdilər və əvvəlinci məclisdə qərar qoydular ki, bundan sora qızların nikahını əllicə manat almamış oxumasınlar.

.......

**Naxçıvan** - "Pürkəndi"ni dağıdıb camaatı birəhmanə qıran Nəmu xan barəsində Molla Mahmud Çakər bura məclislərində elədiyi yağlı mədhlərindən ötrü yüz "barəkallah" ilə min "əhsən və afərin" aldı.

## TƏRCÜMEYİ-HALIM

Ömrümdə on dəfə ölümdən qurtarmışam:

**1)** Balaca uşaq idim - bir yaşında, bibim mənim ağzıma yekə parça qənd verib, qənd boğazımda qalıb. Biçarə atam-anam gedib çöpçü gətirdilər, qəndi gücnən boğazımdan çıxardıblar.

**2)** İki yaşında pilləkandan donbalaq aşıb yıxılmışam, ağzımburnum əzilib.

**3)** Dörd yaşında nökərimiz məni ata mindirib, at qaldırıb vurub daşa, üç ay yatmışam.

**4)** Altı yaşında yoldaşlarımız rus-osmanlı qoşunu qayırıb dava ediblər, daş gəlib dəyib başımdan, özümdən getmişəm.

**5)** On iki yaşında atam mənə bir balaca xəncər alıb, mən də başıma bir dəstə uşaq yığıb düşmüşəm özgə küçənin uşaqlarının canına, neçə dəfə məni bıçaqlıyıblar - yadımdan çıxıb, amma harama baxıram, yara yeridir.

**6)** On səkkiz yaşında bir dostumla "qeyrət" üstündə dava elədik. Az qalmışdı qəməni soxsun qarnıma, mən revolu çıxardıb onu rədd elədim.

**7 və 8)** İki dəfə küçədə tapança davasında olmuşam. Bir dəfə tapança gülləsi gəlib papağımdan keçib.

**9)** Qız üstə bir nəfər qonşumuz ilə müddəi idim. Gecə gedib qaranlıqda ağacın altında mısdım ki, güllə ilə vuram, fürsət olmadı. Amma az qalmışdılar məni tutub öldürsünlər.

**10)** Genə bir dəfə "qeyrət" üstə mənə güllə dəyib. Allah rast salıb sağalmışam.

**Müsəlman**

## E'LAN

Ordubad mahalında Nüsnüs kəndində Hacı Mirağa Hacı Mircəfər oğlu ki əsl ocaq seyid nəslindəndir, hər gün ətrafdan ağanı ziyarət etməyə gələnləri qəbul edir. Qəribə budur ki, kor gələn gözlü gedir, şikəst salamat yola düşür, uşağı olmuyan övrətlər ağanın duasının bərəkətindən haman saat onun evindəcə hamilə olur. Ağanı qarelərə dürüst tanıtmaqdan ötrü filcümlə ağanın camaat ilə olan rəftarından da yazıram. Belə ki birisinə bir manat borc verib on manat höccət alır. Bir pud buğda verib iki pud buğda alar. Və bu ticarətin mənfəətinə ağa keçən illərdə Məkkəyə də gedib hacı oldu. Bunlardan əlavə, çox tə'sirli hər növ dualar yazır, o cümlədən bərəkət duası, yağış yağmıyanda ağa özü yağış yağdırır və qeyrə və qeyrə... Uzaq yerlərdən ağaya dua yazdırmaq və qeyr bir işləri düşən əşxas bu aşağıdakı adresə rücu etsin:

Ordubad mahalı Nüsnüs kəndi, nömrə 19978564.

## MƏTBUAT

"Tərəqqi" "Hilalül-məhərrəm" məqaləsində yazır:

Vərəqrizi-xəzan olan gülbünlərdən qönçeyi-mətbuat şükuftələnir. Bu şükufəzari-ədəbiyyatda sərsəri-zimistanın hərəkati - müstəbidanəsi ilə solmuş çiçəkləri nəsimi-bahar rəvayici-canbəxşayi-rəyahin ilə bəşəriyyəti məhzuz və zövqyab edəcəkdir.

**MOLLA NƏSRƏDDİN**

Bəli, bu gedişlə çox tez zövqyab edəcəkdir.

**"TƏRƏQQİ"**

Peterburqa varid olan mosuq xəbərlərə görə Londra kabinəsi istiqraz pullarının İranda məşrutə əleyhinə sərf olunmuyacağı xüsusunda şahdan tə'minati-qəviyyə tələb olunmasını müzakirə etməkdədir.

**MOLLA NƏSRƏDDİN**

İngilislər axırda qurtdan da tə'minat almaq elmini də örgəniblər. Maşallah!..

---

## *"Əl-ədl" Ərfəüddövlənin qəsidəsindən:*

**Şe'r**

Fəxri-müluki-Osman soltan
bəru bəhr"!"
Əbdülhəmid xan dövvüm
zadeyi-Məcid
Sivü du sal rəftə
zitə'tili-əncümən
Fərman bedad "!" kəz
bazəş künəd səid.
.......
Hürriyyət bexəlq əta kərd "!"
padşah.

**Molla Nəsrəddin**

Görünür, İstanbuldakı yoldaşımız "Qaragöz"ün gözləri elə qaralıb ki, belə bir qəsidəyə gözəl bir nəzirə yazmıyıb.

---

## *GƏNCƏDƏN*

Yanvar ayının beşinci gecəsi məl'un oğlu məl'un iblisin... bay, bay... yox, dilim yanıldı. Lə'nət danosbaza, belə bir nəfər müsəlman qardaşın şeytanlığına görə bir neçə nəfər rəislərin, o cümlədən Pişnamazzadə, Rəfibəyov, Xasməhəmmədovun evlərini çox bərk axtardılar. Amma şeytan şad ola bilmədi. Çünki bir şey tapılmadı!..

Gəncənin mollaları, hacıları, tacirləri bu gün yığılıb hökumətə bir ərizə verdilər ki, məhərrəm ayında hərgah heyzə olub vəfat eləsələr, onların qan bahası tə'ziyə saxlatdıranlardan alınsın. Hökumət də istədi ki, saxlatdıranlardan bu barədə iltizam alsın. Tə'ziyə saxlatdıranlar da buna bərk acıqlandılar. Öz aralarında qərar qoydular ki, bu il hamısı acığnan bircə gün də plov verməsinlər; cəmi plovun pulunu ibtidai məktəblər açmağa xərc eləsinlər. Hesab elədilər, plovların puluna düz on dörd məktəb başa gəlir.

Gəncə meydanının ayağında alış-veriş edən dükançılar və əllaflar bu gün bir yerə yığılıb and içdilər və bir-birinə söz verdilər ki, daha bundan sora biçarə kəndçilərin göz yaşları ilə qazanıb satmaq üçün şəhərə gətirdikləri palazlarını və qeyri şeylərini zornan sürüyə-sürüyə ucuz almasınlar və alandan sora bir də dəbbə eliyib aldıqları qiymətdən kəsməsinlər (bəsdir, səbəti bu da doldurar).

**İmza: Zəhlətökən**

---

## *MÜŞTƏRİLƏR*

Bakıda Nijni Təzəpir küçəsində iki müsəlman kişisi var: biri kərbəlayi, biri məşədi. Bunlar çox müsəlman, allah bəndəsi adamlardır; kişilər öz işlərinə məşğuldurlar. Hərəsinin bir baqqal dükanı var, gecə və gündüz alış-veriş edirlər. Ancaq bu biçarələri müştərilər qoymurlar cümə günü alış-veriş etməsinlər. Bilmirəm müştəriyə bir deyən ola: "Ay müştəri, sənə nə, cümə belə gəldi, şənbə belə getdi". Bir müddət yazıq dükançılar cümə günü kəsb etmədilər, genə nainsaf müştərilər qoymadılar. Bu biçarələr də cümə günü dükanları bağlıyıb, amma dükandakı şeyləri çıxartdılar bayıra. Bunu da müştərilər qoymurlar, deyirlər ki, "biz qışın soyuğunda küçədə buzun üstündə durub cibimizdən pul çıxarda bilmənik, açın dükanı, girək əlimizi manqalda isidək".

Xülasə, binəva dükançılar cümə günləri nainsaf müştərilərin əlindən lap təngə gəlirlər.

**Dəmdəməki**

---

## *SAVAD*

Eşitmişik ki, Nuxa məktəbinin üzvləri uçitel axtarırlar ki, əlində attestatı olsun. Çox gözəl və çox yaxşı. Yaxşı olardı ki, Nuxa camaatı bir az gözlüyələr ki, Bakı uçitelləri Bakı uşkol üzvlərindən bir az qara və yazmaq-oxumaq öyrənsinlər. Çünki uşkol komissiyasının üzvləri çox alimdirlər, ona binaən lazımdır onlardan tə'lim almaq. İnşallah, sonra çox qabiliyyətli müəllimlər çıxıb gələr. Məsələn, bu il Bakıda uşkol komissiyasından bir neçə şəxslər seçilib sədr Makedonski ilə bərabər başladılar uşkol-bauşkol gəzməyə. O şəxslər bunlardır: biri mağazin sahibi, adını yaza bilməz, birisi rusca heç bilməz dükançı, biri nə rusca və nə də müsəlmanca bilməz, qalanı da belə. Xülasə, zərgər, baqqal yığılıb bir yerə uşkollara getdilər. Uçitellər deyən dərsləri xoşlamıyıb tapdılar ki, nəinki uçitellər müsəlmanca bisavaddırlar və bəlkə rusca da. Lazımdı yazmaq seminariyaya ki, rus dərsinə artıq sə'y etsinlər...

Yadındadır Krılovun bir basniyası?

**Dərdmənd**

## OLMUYAN İŞ

18 manat əvəzinə ancaq
6 manat 25 qəpik göndəririk.

1) 21 lazım olan şey: övrət ya kişi üçün açıq cib saatı, əsl qara poladdan, gümüş ilə örtülmüş 36 saatdan və bir dəstəkdən qurulan, düz işləyən; 2) zəncir, Amerika qızılından; 3) zərif Paris qiblənüması; 4) zamşadan saat qabı; 5) zağraniçni dəridən pul qabı, 7 xanəli; 6) kauçukdan ştempel, müştərinin adı yazılmış; 7) ştempel üçün rəng, 8) qızıl üzük 56 problu, möhkəm, modlu, yainki zərif, zağraniçni papiros qabı; 9) təbib Fox icad etdiyi müştük, zərərsiz tütün çəkmək üçün; 10) modni spiçka qabı; 11) zağraniçni cib bıçağı, ikitiyəli ingilis poladından, yainki qayçı; 12) şüşə içində 25 qəribə şəkil, yainki elektrikli cib fanarı, yainki bir cüt qızıl sırğa 56 problu ki əlahiddə qiyməti manat yarımdır. Firmamızı şöhrətləndirməkdən ötrü bu şeyləri 18 manat əvəzinə məhz 6 manat 25 qəpiyə satırıq. Saat örtülü olsa bir manat bahadır. Amerika qızılından örtülü saat 8 manat yarımdır, 10 manatdır və 12 manatdır. Gümüş saat 84 problu, üç qalın qabı ilə, 15 daşlı, ə'lası, açar ilə qurulan 11 manat 75 qəpik, 13 manat və 16 ma-nat (rementuar) başdan qurulan 12 manat yarım, 14 manat və 17 manat. Bu qiymətlərə saatın yanında yuxarıdakı şeylər də göndərilir. Saatın 6 il düz işləməyinə zamin oluruq, göndərilir naloj ilə behsiz, beh göndərənlərə (marka ilə də) saatın üstündə adını da yazırıq.

Adres: Складъ Часовъ Братьевъ Грозовскихъ. Варшава, Твердая № 32-18.

5 dəst bu şeylərdən istəyənlərə bir dənə qara saat da artıq göndəririk. Qorxusu yoxdur; şeylər xoş gəlməsə, geri qəbul edib pulu da təmamən geri göndəririk. Şeylərin yaxşılığına çox razılıqlar almışıq. Sifarişlər rusca yazılmalıdırlar.

### ÇAY QƏDRİ BİLƏNLƏR DİQQƏT ETSİNLƏR
### ƏN Ə'LA ÇAY

Moskvada Vısotski və kampaniyasının çay şirkəti
**Т-ва чайной торговли В.Высоцкий и К°. Москва.**

Sərmayəsi 10.000000 manatdır. İldə 40.000000 manatlıq ticarət eliyir. Yaxşılığı səbəbindən bizim şirkətin çayı nəhayət dərəcədə çox işlənir və bizim şirkət kimi heç kəs o qədər mal satmır. Çayımız çox rəngli və ətirlidir və bir dəfə imtahan üçün çayımızı içən həmişəlik müştərimiz olur. Ticarət nişanəmiz də həmişəki kimi olmağına diqqət eləmək lazımdır. Zaqafqaziya, Zakaspiya və İran üçün şö'bəmiz Tiflisdə Puşkin küçəsində nömrə 7-dir. Telefon nömrə 632.

Тифлисъ, Пушкинская ул., №7. Телефонъ № 632.

## Qafqaz mə'dən sularının idarəsi

Müştərilərə xəbər verir ki, Tiflisdə idarə tərəfindən Qafqaz tabi mə'dən sularının skladı (anbar) açıldı:
Narzan və Yessentuki, nömrə 20
Tiflis. Dvortsov küçəsində, Saracevin imarətində.
Rossiya Transport və Straxovoy cəmiyyətinin kantorasında.
Telefon nömrə 148.
Дворцовая улица, домъ Сараджева, Контора Россійскаго Транспортнаго и Страхового Общества. Телефонъ №148.
Anbarda qiymətləri:
Vaqon ilə (120 yeşik) - hər yeşiyi 11 manat 80 qəpik.
Yeşik ilə (100 yarımbutulka) - hər yeşik 12 manat 30 qəpik.
Və yarımbutulkalar ilə - hər biri şüşəsi ilə 14 qəpik.
Direktor S.Teleçeyev

## ВНИМАНИЮ БОЛЬНЫХЪ!!!

Въ виду появившихся въ продаже вредныхъ для здоровья подделокъ Спермина предлагаемыхъ подъ различными названиями, необходимо при покупке обращать внимание на название

**Сперминъ Пеля**

проф. доктора
**Sperminum poehl**

и требовать таковой в подлинной упаковке Органотерапевтического Института профессора доктора Пеля и сыновей въ С.-Петербурге.

Все имеющиеся въ русской и иностранной литературе многочисленные научные наблюдения выдающихся ученых и врачей над благотворнымъ действиемъ спермина при неврастении, старческомъ маразме, неврастеническомъ половом безсилии, при переутомлении и тяжких заболеванияхъ, какъ малокровии, рахите, подагре, храническом ревматизме, сифилисе, чахотке, брюшном тифе, расстройстве сердечной деятельности (миокордите, ожирении сердца), истерии, спинной сухотке, параличахъ и проч. Относятся исключительно къ спермину профессора доктора Пеля. Сперминъ - Пеля имеется во всех аптекахъ и большихъ аптекарскихъ магазинахъ: 1) въ виде капель (Essentia Spermini - Poehl) 1 флаконъ - 3 руб., а также 2) въ ампулахъ для подкожных впрыскиванияхъ (Sperminum - Poehl pro inyectione) 1 коробка на 4 впрыск. - 3 руб. и 3) в виде клизмъ (Sperminum - Poehl pro clysm) 1 коробка на 4 клизмы - 3 руб.

При требов. литерат. высылающ. безвозмездно, просять указывать болезни для высыл. соответ. наблюд. врачей.

ОРГАНОТЕРАПЕВТИЧЕСКИЙ ИНСТИТУТЪ, ХИМИЧЕСКАЯ ЛАБОРАТОРИЯ И АПТЕКА ПРОФЕССОРА ДОКТОРА ПЕЛЯ И СЫНОВЕЙ ВЪ С.-ПЕТЕРБУРГЕ, ВАС. ОСТР, 7 ЛИНИЯ, Д. №16-181

Наивысшие награды (Grands-Prix) на всехъ всемирныхъ выставкахъ и наилучшие отзывы медицинских авторитетов

## PARİJİN XRONOMETR SAATI

Xronometr saatı

Əsl qızıl saatdan heç seçilmir, çünki elektrik vasitəsilə üç qat qızıl suyu ilə suvanıb işləməyi Parijin observatoriyasında təhqiq olunub və saatsazlıq elmində dəxi bir qüsur qoymuyub. Qapaqları gözəl nəqşlər ilə bəzənib. Qiyməti - Açıq mərdanə - nömrə 6 - 6 manat yarım, nömrə 13 - 8 manat, örtülü zənanə saatları - 9 manat. Göndərmək xərci Avropa Rusiyasına 50 qəpik, Asiya Rusiyasına 75 qəpik. Beh yetişən kimi sifarişə əməl olunur. Beh göndərənlərə pulsuz saat zənciri göndəririk.

Адрес: Московскому Центральному Складу Часовъ,
Москва, д. Виноградова №196

## Hamıya lazım olan şeylər
### Saat və ülgüc

Moskvanın mərkəz saat mağazası tərəfindən 8 manat 95-cə qəpiyə 150 cür şey göndərilir: 1. Qapaqsız saəti-zənanə ya mərdanə, xalis ingilis poladından, saatın mexanizmləri əcnəbi fabriklərində qayrılıb beynəlmiləl saat sərgisində (vıstavkasında) ən böyük mükafat alıblar. Qurulmağı açarsızdır, dəqiqəsinə qədər düzəlmiş olan bu saatın düz işləməsinə zaminik. 2. Zənanə və ya mərdanə, axırıncı moda saat zənciri (zənanə boyundan asmalı). 3. Zərif brelok. 4. Saatın düşməməsi üçün xüsusi məhfəzə. 5. Ülgüc, xalis ingilis poladından. 6. Ülgüc üçün qutu. 7. Nikeldən sabun qabı. 8. Sabun sürtmək üçün şotkə. 9. Bir qutu sabun tozu. 10. Bir qutu pudra. 11. Üzə pudra sürtmək üçün bir dəstə ördək tükü. İstəyənlərə ülgüc əvəzinə əsl brilyantdan seçilməyən Paris brilyantları ilə müzəyyən bir boyun çəngəli ilə bir cüt qulaq sırğası göndərmək olar. 12-14. Ayna, daraq və çəkmə düymələyən çəngəl. 15-19. Əcnəbi fabrikalarında qayrılmış qutu içində 3 döş və 2 də qol düyməsi (zapinkası). 20. Yığılıb açılan Amerika cib qayçısı. 21. Xalis poladdan ya tintəli cib bıçağı. 22-23. Qapaqlı cib qələmi və ya qələm-təraş. 24. Cib davatı (çernilnitsası). 25. Gözəl Paris streskop aləti. 26-75. Streskop üçün 50 ədəd rəsmli (pikantnı) fotoqrafiya kartoçkaları. 76-100. 25 ədəd albom üçün yağlı boya ilə yapılmış kart postal. 101-125. Qutu içində 25 ədəd rəngli poçta kağızı. 126-150. Bunlar üçün 25 ədəd rəngli konvert. Bunların hamısı 8 manat 95 qəpiyədir. Haman əşyalar bir saat ilə bərabər bir manat artıqdır, yə'ni 9 manat 95 qəpikdir. Üç qapağının üçü də 84 problu gümüşdən olan bir saat ilə bərabər 16 manat 95 qəpikdir. Görürsünüz ki, dəxi bundan ucuz şey ola bilməz. Naloj ilə də göndərilir. Sifarişat diqqət ilə göndərilir. Posta məsrəfi Avropayi Rusiya üçün 65 və Asiyayi Rusiya üçün 95 qəpik alınır.

Адрес: Московскому Центральному Складу Часовъ,
Москва, д. Виноградова №196

Zadatka (pul və ya poçta markası) göndərənlərə bir sancaq göndərilir. Təvəqqə olunur ki, bizim firmamızı Varşava firmalarına qarışdırmıyasınız. Malın yaxşılığına zamin oluruq.

## ТОРГОВЫЙ ДОМЪ
*Бр. Едигаровы и Назаровы*

***Yedigarov və Nəzərov qardaşlarının ticarət evi***

***Bu ilin yanvarın birindən Tiflisdə Sivenski küçədə 8-10 nömrəli evdə və İrəvan quberniyası Naxçıvan şəhərində manufaktur (parça) mallarının anbarını bina eliyib əlverişli qiymətlərə satırıq.***

## LAZIM DEYİLSƏ DƏ ALIN

### Saat və 62 əşya

Göndəririk bir dənə saat və 62 əşya məhz altı manat yarıma açıq saat, zənanə ya mərdanə, əsl ingilis poladından. Mexanizmi əcnəbi məmləkətlərdə qayrılıb və dəqiqəbədəqiqə düz işləməyinə zaminik. 1. Zənciri-zənanə və ya mərdanə, axırıncı modada 2. Zərif brelok, zaqranitsada qayrılmış. 3. Amerikanski bükülü cib qayçısı. 4. Yol üçün zərif mürəkkəb qabı. 5-6. Bükülü karandaş və qələm. 7-31. 25 vərəq poçta kağızı. 32-56. Bunlar üçün paket. 57. Şaren dərisindən neçə gözlü pul qabı. 58-62. 3 dənə döşdən ötrü və 2 dənə zərif qol düymələri (zapinka) ki bunlardan ötrü bizə çox razılıqlar gəlib və əlahiddə qiymətləri 2 manat yarımdır. Bəs 6 manat yarıma siz 63 dənə ən lazımlı əşya alırsınız. Əgər örtülü saat istəsəniz, qiymətləri 7 manat yarımdır, amma açıq gümüş saat ilə - 13 manat yarımdır. Şeylərin səliqəli qablanmağı bizim öhdəmizədir. Naloj ilə göndərilir. Xərci Avropayi Rusiyada 50 qəpik, Asiyayi Rusiyada 75 qəpik. Şeylərin yaxşılığına zəminik.

Адрес: Московскому Центральному Складу Часовъ,
Москва, д. Виноградова №196

Marka ilə, pul ilə zadatok göndərənlərə müftə göndərilir on dənə yağlı rəng ilə yazılmış açıq poçta vərəqləri (otkrıtka). Təvəqqə edirik Varşava firmaları ilə qarışdırmıyasınız.

"Molla Nəsrəddin"in əvvəlinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır. Qiymətləri idarədə: əvvəlinci ili 6 manat, üçüncü ili - 6 manat yarım, boş cildi - 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili - 6 manat yarım, üçüncü ili - 7 manat, boş cildi bir manat.

İkinci ilin kitabları yavuq vaxtlarda hazır olacaq.

UCUZ VƏ DÜZ İŞLƏYƏN SAAT

## Saat "KAVALER"

Axtaran müştərilərin arzularını nəzərə alıb biz qət elədik ki, 3 manat 95 qəpiyə onlara açıq kişi saatı verək. Bu saatın adı "KAVALER"dir və təkmil mexanizmi var, qabı şəfəqli və tutqun göy rənglidir. Siferblatı qızıl və ya gümüş suyu ilə suvanıb, qurulmağı dəstəsindəndir. Düz işləməyinə zəmanət edirik. Sifarişlərə tə'xirsiz əməl olunur. Göndərmək xərci: Avropa Rusiyasına - 50 qəpik, Asiya Rusiyasına - 75 qəpik.

Адрес: Московскому Центральному Складу Часовъ,
Москва, д. Виноградова №196

Beh verənlərə müftə göndəririk kişi ya övrət saat zənciri.

IV ГОДЪ ИЗДАНИЯ | № 3 | ЯНВАРЯ 18-ГО 1909г.

# "Молла Насреддинъ"

*КОНТОРА и РЕДАКЦИЯ*
журнала
"Молла Насреддинъ"
Тифлисъ
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу....................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНИЕ*
*За место занимаемое строкою*
*Петита впереди текста .....10 коп.*
*позади * * * .....7 коп.*



Eh, xanımlar, zəhləmizi tökmüyün, budur mənim
corabım, görün qoxu bundan gəlir ya sizin saçınızdan. (Qafqaz dəmir yolunda ikinci klasda)

# ملا نصر الدین

№ 4. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپیک ۴





Литог С.

A kişi, sən Allah, at getsin cəhənnəmə bu zəhrimarı, hövsələm darıxdı.

Şamaxı qəbiristanlığı




Qəbrə hörmət ikicə gün lazımdır, elə ki köhnəldi,
daşlarını çıxart apar qoy evinin divarına.

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**
**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**15 məhərrəm 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 25 yanvar 1909**



# NİSAB

Əla ey ki dari tü ba xüd güman
Fəulun, fəulun, fəulun, fəul
Oxu işbu bəhri varınsa həvəs
Bax ayineyi-şe'rə gör rəsmini
Səhər mən be ayinə kərdəm nəzər
Məra kar ba ömr bazid nist
Vəleykən bu şeytan məni qoymayır
Bu sözlər deyil puç, bimənfəət
Vəli ma ke həstim cüz' sur'əti
Həmə kahil, qafili-cahilim
Baxın və'zinə şeyx ne'mətlərin
Məhərrəmdir iştə verin bir qulaq
Məkon töreş reviş beman qareya
Zi şeyxani-mürşid diləm purələm
Ha min dəf'ə söylə bu qövmə qəmi
Məhərrəm gəlib sanki bir eyddir
Həmə surx, rəngin sər, dəst, pa
Be dil dərdi-möhnət, bəsər dudi-ah
Bu övzaya baxdıqca dil xun olur
Mənə, şe'rimə lə'n edərlər yəqin
Zi güftari-xud mən nə tərsəm ki çün

Vey on ke tələbkərdeyi-ab, nan
Həminəst bəhri-təqarib bedan.
Cavansan qəvi, pirsən natəvan.
Sora fikr elə, xəndə qıl ya utan.
Bedidəm daru surəti - vəhşiyan.
Çe alim, çe fazil, çe cahil çoban.
Edir vəsvəsə tovladır hər zaman.
Ola kaş bu mətləbi anlıyan.
Nədarim əz adəmiyyət nişan.
Həmə lafzəni-hiyləgər, şarlatan.
Üzündə görün varmı bir qətrə qan?
Nə söylər tamaşa edin rövzəxan.
Miyəndiş mən münkirəm: əl'aman,
Zi kirdari-sofi şüdəm nimcan.
Ha danna, ha söy, varmıdır bir qanan?
Rəvac oldu bazari-cövhər satan.
Səbilhayi rişi-kuhənpərvəran.
Be çeşm əndər abəst rövşəndilan.
Vətənxahi-irfani-noməslək an.
Bütün müftəxorlar, bütün əbləhan.
Xuda yari-həqq kust hər du cahan.

**Keyfsiz**







## BÖYÜK MƏSƏLƏ

"Tərcüman" 81-ci nömrəsində "Böyük məsələ" adı ilə yazdığı baş məqaləsində camaatımıza belə bir təklifdə bulunur: "Bu dəfə maarif nəzarəti Krım milli məktəblərinə etdiyi təklifdən ana dilində fənn verilməməsi və bu halda məktəblərin maarif nəzarətinə tabe tutulması iqtiza etdiyi anlaşılır. Əgər belə isə maarifi - milliyyəmizin ağırlaşacağı aşkardır; üç-dörd ildə kəsb olunacaq elm beş-altı il (bəlkə daha ziyadə) çəkəcəkdir. Bu işin çarəsinə baxmaq təzə ilin bizlərcə ən əhəmiyyətli iş və məsələsidir...

Milli məktəblərdə təhsilin mütləq rus dilində olacağına dair bir zakon bilmirik. Amma deyək ki, milli dildə təhsil qadağan olsun... Bu halda idareyi-ruhaniyyə Dumadakı fraksiyamız vasitəsilə dövlət Dumasına və mətbuat vasitəsilə camaata müraciət edib indidən çarəsinə baxmaq lazımdır..."

**MOLLA NƏSRƏDDİN**

Hələ tutaq ki, "Tərcüman"ın bu sözləri doğrudur. Hələ, xudanəkərdə, tutaq ki, bu məsələ, həqiqət, can məsələsidir; ondan ötrü ki, gələcəkdə dilimizi saxlıyan milli məktəblərimiz olacaq və dilimizi kəsmək vücudumuzu balta ilə kəsməkdir. Lakin bilmirik ki, bu ulu yazıçımız "Tərcüman" bu sözləri kimdən ötrü deyir? Aya, görək bu sözləri eşidən qulaq varmı? Bu sözlərdən mütəəssir olan ürək varmı? Sözün doğrusu, biz qafqazlılar ilə bu cür zarafat eləmək olmaz, o səbəbə ki, Qafqaz dağları möhkəmlikdə köhnə adətlərimizi və dibsiz cəhalətimizi tərpətməyə "Tərcüman"ın sözləri kifayət edə bilməz. "Tərcüman"dan təvəqqə edirik çox da qəm yeməsin ki, oktyabristlərin qanunu Dumada təsdiq olunacaq və idareyi-ruhaniyyələrimizin, cəmiyyəti-xeyriyyələrimizin, nəşri-maariflərimizin nəzarətlərindəki milli məktəblərimiz hökumət idarəsinə keçəcək. Çox da ürəyini sıxmasın ki, "səadət"lər, darülmüəlliminlər, "ittihad"lar qapanacaqlar - çox da ki qapanacaqlar, bizlərə heç təfavüt etməz. Ondan ötrü ki, onsuz da bu cür təzə məktəblərimizdə təzə üsulda tə'lim verməyi ruhanilərimiz haram bilib qoymurdular. Gəncədə məktəbi-ruhaniyyənin fars dili müəllimi Molla Yusif Kərbəladan gələndə cibində müctəhid fitvası gətirmişdi ki, təzə məktəblərdə oxumaq günahdır.

**(Mabə'di var)**

## MƏRSİYƏXAN XƏBƏRLƏRİ

Aşqabad məscidində mərsiyəxan nağıl edir:

Vəqta ki, müsəlmanlar gəldilər Xeybər qalasını alsınlar, qalada sakin olan yəhudilər belə qərar qoydular ki, xoruzlar banlıyanda qaladan qaçsınlar. Amma o gecə xoruzlar qəsdnən banlamadılar və müsəlmanlar qalaya girib kafirlərin hamısını qırdılar. Belədə yəqin olur ki, qaladakı xoruzlar müsəlman imişlər.

.......

Bakıda məhərrəmin dördüncü gecəsində bir mərsiyəxanın saatını, əbasını və üç manat pulunu məsciddə ağlıyan müsəlmanlar oğurladılar.

.......

Gəncədə "Sofili" məhəlləsinin mərsiyəxanı hökumətə şikayət verib deyir ki, "camaatnan danışmışdım məhərrəmlikdə mərsiyə oxuyam və camaat mənə borclu idi otuz tümən versin, amma indi on beş tümən verir".

.......

Şirvanda Molla Ruqiyyə bacının və'dəsini alıblar ki, səfər ayının axırınadək mərsiyə oxusun. Arvadlarımızın tərəqqisi aşkar oldu, gözlərimiz aydın olsun:

"Küşad bad bəhacət həmişə
in dərgah,
Bəhəqq əşhədü inna ilahə
illallah".

.......

Aşqabadın yavuqluğunda Duşaq stansiyasında 15 müsəlman evi var. Bu il buraya Ərdəbildən üç mərsiyəxan gəlib və camaat da üç partiya olub, çünki mərsiyəxanların hər biri istəyir camaatı öz tərəfinə çəksin. Çox ehtimal var ki, axırda müsəlmanların içinə ədavət düşə.

## ŞİKAYƏT

Biz Nuxa camaatı "Molla Nəsrəddin" vasitəsi ilə Mirzə Fərəc Pişnamazzadə cənablarından çox artıq gilay edirik ki, Nuxaya qədəm qoyan kimi bizim cəlalımızı pozdu. Belə ki biz hər il məhərrəmlikdə baş yarardıq. Amma müşarileyh o qədər elədi ki, bu gözəl adəti bizim içimizdən götürdü. Həqiqət, yerdən göyə kimi biz ondan narazıyıq. Vəssalam.

### BƏDNƏZƏR

Gəncədə müsəlmanların Nəşri-maarif və Xeyriyyə cəmiyyətlərindən bizə çox tə'riflər gəlir. Hər gün bizə yazırlar ki, bu cəmiyyətlərin üzvləri çox, çox, çox artıq çalışırlar və çox-çox işlər görürlər.

Biz öz tərəfimizdən üzvlərə belə məsləhət görürük ki, bir az ehtiyatlı olsunlar, ondan ötrü ki, dünyada bədnəzər çoxdu.

### NUHUN GƏMİSİ

Culfada Mirzə Ələkbər ağa ki xeyli mö'min və müqəddəs bir vücuddur - isbat eliyir ki, Nuhun gəmisi İrəvanın yanında olan Ağrı dağın üstündə dayanıb.

### MƏŞHUR ALİMLƏRİMİZ

Avropa millətləri həmişə öz şöhrətli alimlərinin tərcümeyihalını yazıb kitab bağlallar və dünyaya dağıdarlar ki, hamı bilsin filan millətin filan və filan alimləri var.

Biz həmin nömrəmizdən başlıyıb şöhrətli adamlarımızı yazıb axırda bir kitab bağlıyacağıq ki, özgə tayfalar oxuyub bizi də bir adam hesab eləsinlər.

Başlıyaq Şamaxıdan:

Əvvəlinci: Kərbəlayı Məhəmməd Mirzə Süleyman oğlu. Bu cənabın atası duayazan imiş, oğlu da baxıb görüb ki, atasının sənətini işlətməsə naxələf olar. İndi özü də həmi darğalıq eliyir və həmi cadubazlıq eliyir. Allah ömür versin.

İkinci: Molla Kərim axsaqdır. Bu cənabın da elmi-tibb və duanəvislikdə çox yədi var idi. Hətta Mazandaran şəkərinin səhl olmağını da bilir və bu cənabda əcinnəbaşının tükündən də var və gələn arvadlara göstərir.

Üçüncü: Boyaqçı Kərbəlayı Əli həmşəridir. Bu cənab da Şamaxıda bir arvad alıb dul və o arvadın qabaqkı ərindən bir kitab qalıb, onilə bu da duayazan olub və öz sənətini tərk eliyib.

Dördüncü: Qurd Məhəmməd namdır. Bu cənab doğrudan da cinin yuvasını bilir, zalım oğlu zalımın əlindən heç bir sirr qurtara bilməz.

Beşinci: Molla Kazım qızı Güllü xanımdır. Bu da atasının kitablarına sahib olmuşdu. O qədər cinlərə əziyyət verdi ki, axırda özü də cin oldu və qeyzi tutanda az qalırdı cinləri yesin.

**Kəlniyyət**

(Mabə'di var)

## TELEQRAF XƏBƏRLƏRİ

**Bakı** - Şümr olmağı heç kəs qəbul etmədiyindən bu il aşura günü şəbih oyunu başa gəlmədi.

**Orenburq** - Hökumət müsəlman inqilabçılarını indiyə qədər tanıya bilmirdi ki, tutsun. Lakin bu həftə "Din və məişət" məcmuəsi xəbər verir ki, bığını kəsmiyən hər müsəlman inqilabçıdır. Güman var ki, hökumət bu nişanə ilə hamısını tutsun.

.......

**London** - "Tayms" müxbiri Tiflisdən belə teleqraf vurur: Məşhədi - Müqəddəsdə imam qəbrinin topa tutulmaq xəbəri Qafqazdakı iranlıları öylə bir mərtəbə qəmgin elədi ki, imam xeyratlarındakı yağlı plovları yeməyə iştahaları qaçdı.

.......

**Buxara** - Əmir cənabları osmanlı məclisinə təbrik teleqramı göndərdi.

.......

**Şəki** - Bakıdan, Tiflisdən və qeyrə çox şəhərlərdən teleqrafla soruşurlar ki, Şəki axundları və camaatı aşura günü nə səbəbə baş yarmağı qaldırıblar?

.......

**Nyu-York** - Londondan xəbər verirlər ki, cəmi dünya üzündəki iranlılar aşura günü şahın ziddinə dəhşətli mitinqlər qurub, Avropanın şaha kömək etməməyini tələb ediblər.

.......

**İrəvan** - Şümr şəbehini gətirən cənab öz rolunu elə məharətlə əmələ gətirdi ki, əsl Şümrdən qıl qədər fərqi yox.

.......

**Tomsk** - Müsəlmanların gözləri aydın olsun ki, Axund Damla Həmzə "Əzalətül-əvham fi nüzuli-İsa əleyhüssəlam" adında müsəlmanlar üçün çox əhəmiyyətli bir kitab nəşr elədi.

.......

**Gəncə** - Aşura günü Məşədi Haqverdinin göyərçini şəbeh atından yerə düşdü. Deyirlər bu iş Gəncənin başına bir müsibət gələcəyinə nişanədir.

.......

**Peterburq** - Azərbaycanın bugünkü halətini nəzərə alan Rusiyadakı cəmi iranlılar bu il hər yanda imam xeyratını bərhəm edib onun pullarını Azərbaycana göndərmək xəyalındadırlar. Əgər bu xəbər doğru isə, bu ehsan pulları şaha verdiyimiz və verəcəyimiz borc puldan neçə milyon artıq olacaqdır ki, şah bunun qabağında heç bir zad edə bilmiyəcəkdir?

.......

**Culfa** - İqbalüs-səltənə tərəfindən beş yüz igid sərbaz pusquya qoyulub ki, Səttarxana gedəcək ehsan pullarını ki neçə milyondur, zəbt eləsinlər.

## XƏBƏR

Ayın 7-də Gəncədə camaat birdən baxıb gördü ki, müsəlman dükanlarının hamısı bağlıdır. Adə, bu nə xəbərdi, nə var? Hə iş ittifaq düşüb? Hamı qaldı mat və məəttəl, çünki nə rus prazdniki idi, nə də müsəlman bayramı. Bir yanda da ehsan-zad yox idi ki, hamı oraya getmiş oleydi.

Axırda işin əsli mə'lum oldu. Deməginən haman gün klubda müsəlman teatrı var imiş və bu teatrdan cəm olunan pulları Şeyx Nizaminin nişangahına sərf eliyəcəkmişlər. Dükançılar da səhərdən duymuş imişlər ki, bikar müsəlman cavanları düşəcəklər bazara və dükançılara bilet təklif edəcəklər. Gözüm dükançılar da acığnan dükanları açmıyıblar ki, bilet satanlar əliboş qayıdıb getsinlər.

Amma nə bijdilər!!!

## GƏNCƏ

Qubadakı çayçı dükanını məhərrəmqabağı təzəcə bağlıyıb şəhərimizə gələn mərsiyəxan həm Ozan məhəlləsində və həm də cənab Ədilxan Ziyadxanovun evində çox tə'sirli mərsiyə oxuyur.

Moizəsində şəhərimizin bə'zi intelligentləri də çox ədəblə diz üstə oturub canü dildən qulaq asırlar.

Cənab mərsiyəxan minbərdə cəmi tərəqqi və hürriyyət tərəfdarlarını, xüsusən məşrutəpərəstləri və hamı qəzetə yazanları təkfir edib camaata lə'nət oxutdurur. Mərsiyə yerlərimiz, həmd olsun, çox bol lə'nət ilə dolur. Deyirlər ki, bir neçə yerdə lə'nətin ağırlığından "vərəsətül-ənbiya"ya məxsus minbərlər davam gətirmiyib çatlıyıblar.

## NƏSİHƏTİ-PƏDƏRANƏ

1. Hərgah oxucularımızın yolu, güzarı Nuxa şəhərinə düşsə, biz məsləhət görürük ki, qəbl əz-vəqtdən qabaq saqqallarını uzatsınlar və üzlərini qırxdırmasınlar və hamama çox gedib özlərini gözəllləndirməsinlər. Çünki əl-arifü filişarə.

2. Hər kəsin yolu Bakıya düşsə, heç kəsə deməsin ki, mən qəribəm, hər kəs xəbər alsa desin ki, mən mərdəkanlıyam (bunun səbəbini "Dəmdəmaki"dən sual etməlidir).

3. Hər kim ki hələ cavandır (molodoydur) və saqqalı çıxmıyıbdır, Şuşa şəhərinə səfər eləməsin (bu da sirri-məknundur).

4. Hər kəs Gəncə şəhərinə qumar oynamağa getsə, özgə mehmanxanaya nüzul eləmiyib düz gedib Zərrabi küçəsindəki "Parij" mehmanxanasına düşsün, çünki ürəkləri hər nə istəsə hazırdır (Ağdaş, Qarabağ, Yevlax və Nuxa müsafirlərinin gözləri aydın).

5. Hər kəsin güzarı İrəvana, Naxçıvana düşsə, yaxşı olar ki, bircə dəfə də meygədana getməsin, çünki müsəlmanlardan macal tapıb bir udum konyak da içə bilmiyəcəkdir.

6. Hər kəs Ordubad şəhərinə getməli olsa, məsləhətdir ki, başına bir yekə papaq qoyub, əyninə İran paltarı geyib, belinə qurşaq bağlasın. Şapka-mapka yeri deyil, əngini dişinə verərlər.

## E'LAN

Qoçuların tərəqqisini nəzərə alıb məhz müsəlmanlara xidmət etmək üçün açdığımız kantor işə başlamışdır:

1. Hər bir qoçuya lazım və vacibdir ki, öz canını mühafizə etmək üçün qüvvəsindən gəldiyi qədər pulunu müzayiqə etməsin, yə'ni üç yüz manatdan keçib bizim kantorumuza rücu' etsin. O vaxt biz onun üçün Berlin şəhərindən bir geyim gətirdərik ki, atışan vaxtında nə güllə və nə də xəncər batar.

2. Hər bir qoçu öz qoçuluğunu isbat edəndən sora onu straxovoy etdirərik, ildə özünə də üç yüz manat pul verərik, bəşərti ki xudanəkərdə ölsə eləsə straxovoy pulu bizə çatsın. Çünki qoçuların ömürləri alınlarına əcəli-məəlləq yazılıbdır.

**Adres: Bakı.**

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə

## E'LAN

1. "Hesab məsələsi" (Задачникъ). Bu kitab məktəblərdə və evlərdə hesab tə'limi üçün tərtib olunub 761 hesab məsələsini, 237 tə'limati-rəqəmiyyəni və Rusiyada iste'mal olunan ölçüləri və ölçülərə dair tə'limləri havidir. Qiyməti 35 qəpikdir.

2. Gündəlik dərsləri yazmaq üçün yövmiyyə dəftəri (Дневникъ).

Şagirdlərə gündəlik, həftəlik, aylıq və illik nömrələr qoymaq və dərsləri yazmaq üçün cədvəlləri və bə'zi digər mə'lumatı havidir. Qiyməti 30 qəpik.

Bu kitabları almaq istəyən müəllimlərə və kitabçılara böyük təfavüt qoyulacaqdır. On əddədən əskiyinə poçta markaları qəbul olunur. Xahiş edənlərə naloj ilə göndərilir.

Adres: Gəncədə Həmidbəy Yusifbəyova, yaxud Məktəbi-ruhani kitabxanasına.

PARİJİN XRONOMETR SAATI

Xronometr saatı

Əsl qızıl saatdan heç seçilmir, çünki elektrik vasitəsilə üç qat qızıl suyu ilə suvanıb işləməyi Parijin observatoriyasında təhqiq olunub və saatsazlıq elmində dəxi bir qüsur qoymuyub. Qapaqları gözəl nəqşlər ilə bəzənib. Qiyməti - Açıq mərdanə - nömrə 6 - 6 manat yarım, nömrə 13 - 8 manat, örtülü zənanə saatları - 9 manat. Göndərmək xərci Avropa Rusiyasına 50 qəpik, Asiya Rusiyasına 75 qəpik. Beh yetişən kimi sifarişə əməl olunur. Beh göndərənlərə pulsuz saat zənciri göndəririk.

Адрес: Московскому Центральному Складу Часовъ,
Москва, д. Виноградова №196

*ТОРГОВЫЙ ДОМЪ*
*Бр. Едигаровы и Назаровы*

***Yedigarov və Nəzərov qardaşlarının ticarət evi***

***Bu ilin yanvarın birindən Tiflisdə Sivenski küçədə 8-10 nömrəli evdə və İrəvan quberniyası Naxçıvan şəhərində manufaktur (parça) mallarının anbarını bina eliyib əlverişli qiymətlərə satırıq.***

**Hamıya lazım olan şeylər**
**Saat və ülgüc**

Moskvanın mərkəz saat mağazası tərəfindən 8 manat 95-cə qəpiyə 150 cür şey göndərilir: 1. Qapaqsız saeti-zənanə ya mərdanə, xalis ingilis poladından, saatın mexanizmləri əcnəbi fabriklərində qayrılıb beynəlmiləl saat sərgisində (vıstavkasında) ən böyük mükafat alıblar. Qurulmağı açarsızdır, dəqiqəsinə qədər düzəlmiş olan bu saatın düz işləməsinə zaminik. 2. Zənanə və ya mərdanə, axırıncı moda saat zənciri (zənanə boyundan asmalı). 3. Zərif brelok. 4. Saatın düşməməsi üçün xüsusi məhfəzə. 5. Ülgüc, xalis ingilis poladından. 6. Ülgüc üçün qutu. 7. Nikeldən sabun qabı. 8. Sabun sürtmək üçün şotkə. 9. Bir qutu sabun tozu. 10. Bir qutu pudra. 11. Üzə pudra sürtmək üçün bir dəstə ördək tükü. İstəyənlərə ülgüc əvəzinə əsl brilyantdan seçilməyən Paris brilyantları ilə müzəyyən bir boyun çəngəli ilə bir cüt qulaq sırğası göndərmək olar. 12-14. Ayna, daraq və çəkmə düymələyən çəngəl. 15-19. Əcnəbi fabrikalarında qayrılmış qutu içində 3 döş və 2 də qol düyməsi (zapinkası). 20. Yığılıb açılan Amerika cib qayçısı. 21. Xalis polad-dan ya tintəli cib bıçağı. 22-23. Qapaqlı cib qələmi və ya qələm-təraş. 24. Cib davatı (çernilnitsası). 25. Gözəl Paris streskop aləti. 26-75. Streskop üçün 50 ədəd rəsmli (pikantnı) fotoqrafiya kartoçkaları. 76-100. 25 ədəd albom üçün yağlı boya ilə yapılmış kart postal. 101-125. Qutu içində 25 ədəd rəngli poçta kağızı. 126-150. Bunlar üçün 25 ədəd rəngli konvert. Bunların hamısı 8 manat 95 qəpiyədir. Haman əşyalar bir saat ilə bərabər bir manat artıqdır, yə'ni 9 manat 95 qəpikdir. Üç qapağının üçü də 84 problu gümüşdən olan bir saat ilə bərabər 16 manat 95 qəpikdir. Görürsünüz ki, dəxi bundan ucuz şey ola bilməz. Naloj ilə də göndərilir. Sifarişat diqqət ilə göndərilir. Posta məsrəfi Avropayi Rusiya üçün 65 və Asiyayi Rusiya üçün 95 qəpik alınır.

Адрес: Московскому Центральному Складу Часовъ,
Москва, д. Виноградова №196

Zadatka (pul və ya poçta markası) göndərənlərə bir sancaq göndərilir. Təvəqqə olunur ki, bizim firmamızı Varşava firmalarına qarışdırmıyasınız. Malın yaxşılığına zamin oluruq.

**LAZIM DEYİLSƏ DƏ ALIN**

**Saat və 62 əşya**

Göndəririk bir dənə saat və 62 əşya məhz altı manat yarıma açıq saat, zənanə ya mərdanə, əsl ingilis poladından. Mexanizmi əcnəbi məmləkətlərdə qayrılıb və dəqiqəbədəqiqə düz işləməyinə zaminik. 1. Zənciri-zənanə və ya mərdanə, axırıncı modada 2. Zərif brelok, zaqranitsada qayrılmış. 3. Amerikanski bükülü cib qayçısı. 4. Yol üçün zərif mürəkkəb qabı. 5-6. Bükülü karandaş və qələm. 7-31. 25 vərəq poçta kağızı. 32-56. Bunlar üçün paket. 57. Şaren dərisindən neçə gözlü pul qabı. 58-62. 3 dənə döşdən ötrü və 2 dənə zərif qol düymələri (zapinka) ki bunlardan ötrü bizə çox razılıqlar gəlib və əlahiddə qiymətləri 2 manat yarımdır. Bəs 6 manat yarıma siz 63 dənə ən lazımlı əşya alırsınız. Əgər örtülü saat istəsəniz, qiymətləri 7 manat yarımdır, amma açıq gümüş saat ilə - 13 manat yarımdır. Şeylərin səliqəli qablanmağı bizim öhdəmizədir. Naloj ilə göndərilir. Xərci Avropayi Rusiyada 50 qəpik, Asiyayi Rusiyada 75 qəpik. Şeylərin yaxşılığına zəminik.

Адрес: Московскому Центральному Складу Часовъ,
Москва, д. Виноградова №196

Marka ilə, pul ilə zadatok göndərənlərə müftə göndərilir on dənə yağlı rəng ilə yazılmış açıq poçta vərəqləri (otkrıtka). Təvəqqə edirik Varşava firmaları ilə qarışdırmıyasınız.

"Molla Nəsrəddin"in əvvəlinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır. Qiymətləri idarədə: əvvəlinci ili 6 manat, üçüncü ili - 6 manat yarım, boş cildi - 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili - 6 manat yarım, üçüncü ili - 7 manat, boş cildi bir manat.

İkinci ilin kitabları yavuq vaxtlarda hazır olacaq.

UCUZ VƏ DÜZ İŞLƏYƏN SAAT

**Saat "KAVALER"**

Axtaran müştərilərin arzularını nəzərə alıb biz qət elədik ki, 3 manat 95 qəpiyə onlara açıq kişi saatı verək. Bu saatın adı "KAVALER"dir və təkmil mexanizmi var, qabı şəfəqli və tutqun göy rənglidir. Siferblatı qızıl və ya gümüş suyu ilə suvanıb, qurulmağı dəstəsindəndir. Düz işləməyinə zəmanət edirik. Sifarişlərə tə'xirsiz əməl olunur. Göndərmək xərci: Avropa Rusiyasına - 50 qəpik, Asiya Rusiyasına - 75 qəpik.

Адрес: Московскому Центральному Складу Часовъ,
Москва, д. Виноградова №196

Beh verənlərə müftə göndəririk kişi ya övrət saat zənciri.

IV ГОДЪ ИЗДАНИЯ № 4 ЯНВАРЯ 25-ГО 1909г.

# "Молла Насрединъ"

*КОНТОРА и РЕДАКЦІЯ*
журнала
"Молла Насрединъ"
Тифлисъ.
*Давидовская ул. д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКИЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу....................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНІЯ*
*За место занимаемое строкою*
*петита впереди текста .....10 коп.*
*позади * * * .....7 коп.*




Qafqazda öz kəndində | Müsəlman intiligenti və xanımı | Parijdə


جوان تورك لر و مشروطه
Греція
يونان
بولغار
Болгарія
آفستريا
Австрія
Младотурки и конституція.
Стар. турокъ

1909г. دوردنجی ایل ۱۹۰۹

# ملانصرالدین

№ 5. Цѣна 12 к. МОЛЛА НАСРЕДДИНЪ قیمتی ۱۲ قپیک ۵




- Balkan məsələsi













- Müsəlmanın bütün il məşğuliyyəti

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiyada:
12 aylığı - 5 manat
6 aylığı - 3 manat
3 aylığı - 1 manat 60 qəpik
Əcnəbi məmləkətlərə 12 aylığı - 6 manat
6 aylığı - 4 manat

Nüsxəsi idarəmizdə - 10 qəpik
Özgə şəhərlərdə - 12 qəpik

**İdarə və kantor**
*Tiflis, Davıdov küçəsi, nömrə 24.*
*Тифлисъ, Давидовская ул., д.24.*

**Teleqram üçün adres: Tiflis, "Molla Nəsrəddin"ə.**

**Тифлисъ, "Молла Насреддинъ"**
**Редакция журнала "Молла Насреддинъ"**

**E'lan qiyməti**
**Qabaq səhifədə petit ilə bir sətri 10 qəpik, dal səhifədə 7 qəpik.**
**Adres dəyişmək haqqı 3 dənə yeddi qəpiklik markadır.**

**22 məhərrəm 1327, bazar Həftədə bir dəfə çıxan türk məcmuəsidir 1 fevral 1909**



## FÜQƏRA

Bir neystanda qalmışam tənha,
Dad, fəryadıma çatan yoxdur.
Vəhşilər içrə etmişəm mə'va,
Ah, bir halıma yanan yoxdur.

Pək yaman xofnakdır vətənim,
Xəsü xaşakdır gülüm, çəmənim,
Uçunur qəlb, titrəyir bədənim,
Oluram boylə bir məkanda fəna,
Vay, bir dərdimə qalan yoxdur.

Məskənimdir tikanlı bir səhra,
Sakinatı tamam bisərü pa,
Cümlə bədkar, cümlə bədsima,
Rəbbəna-rəbbəna - xuda və nida,
Can xilas etməyə güman yoxdur.

Vətənimdən uzaqdır insanlıq,
Buradır gör ki əsl heyvanlıq,
Dərə xəlvət, şəğal edir xanlıq,
Edilir bəs ki ruhimə iyza,
Kəsilib taqətim, təvan yoxdur.

Yox nişan zərrə adəmiyyətdən,
Mə'rifətdən, nə qabiliyyətdən,
İki min kəlmə de həqiqətdən,
Eşidilməz olur cəfa hətta,
Bircə insan dili qanan yoxdur.

Barkeşlikdə cümləsi xərdir,
Zülmə tab eyləməkdə əstərdir,
Qətl-sirqətdə leyk əjdərdir,
Hiyləgərlikdə alimü dana,
Ədəbü elmdən nişan yoxdur.

Hamısı köhnə, xah köhnəpərəst,
Badeyi-qəflət ilə yeksər məst.
Oluram hər günü giribandəst,
Cahil ilə mürid ya molla...
Bikəsəm, yar, kardan yoxdur.

**Keyfsiz**







## ÜLƏMA

Bəndə ömrümdə çox moizələr, çox xütbələr eşitmişəm, lakin tasua günü "Səadət"də fəxrülislam olan Axund Molla Ələkbər cənablarının moizəsi kimi bir moizə hələ eşitməmişəm. Bu moizə insanın ruhunu guya quş qanadları üstünə alıb cümlə avam insaniyyəti seyr etdirir idi və insan seyr etdikcə qəlbi riqqətlənib, ruhu ucalıb özündə bir ülviyyət, bir əzəmət hiss etməyə məcbur edir idi.

Bilirmisiniz axund həzrətləri nədən danışırdı? Haman bizim insanlıq və müsəlmanlıq təkalifimizdən! İslam niyə bu günlərə qaldı? Ondan ötrü ki, camaatımız üləmaya pul vermir. Hərçənd üç milyon müsəlmanın yarısı üləmadır, amma bu üləma müsəlmanların pulu ilə təhsil eləmiyib; bunların təhsil xərcləri Amerikada Kaliforniyanın qızıl mə'dənlərindən gəlib. Sora elə ki üləmamız başlıyıblar çörək qazanmağa, genə camaatımız bunlara bir qəpik də vermiyib və İrəvanda, Bakıda, Şamaxıda, Naxçıvanda, Təbriz və Tehranda üləmamız nə qədər ki imarət tikdirib kəndlər qazanıblar, hamısının mədaxili Yaponiya camaatından gəlib, yoxsa müsəlman hacı və məşədilərinin və kəndlilərinin ciblərindən bir qəpik də çıxmıyıb.

Genə bilirmisiniz ki, axund həzrətləri nədən danışırdı? İslam niyə bu günlərə qaldı? Ondan ötrü ki, əğniyamız millət qeydinə qalmırlar və məktəblər açmırlar və heç kəs deməsin ki, Tağıyevlər qız məktəbləri açıblar, Nağıyevlər darülmüəllimin açıblar və qeyr əğniyazımız qeyr bir şey açıblar. Xeyr, xeyr, bunların hamısını eliyən üləmadır. Məktəblərə, şəfa evlərinə, yetim evlərinə ciblərindən pul çıxarıb verən üləmadır.

Füqəraya gəldikdə, bunlar da sırf cahil, sırf vəhşi. Lakin bu füqərada da günah çoxdur: ondan ötrü bunlar da üləma hazır etmək qeydinə qalmırlar. Xülaseyi-kəlam, günahların hamısı genə də bizim camaatdadır. Bir para axmaqlar elə güman eliyirlər ki, üləma gərək camaatın təhsili qeydinə qalsın. Amma bu batil bir fikirdir, çünki camaatın canı cəhənnəmə, ancaq üləma üçün elm oxumaq lazım, vəssalam.

Allah ömür versin! Biz axund cənablarının fərmayişini başdan-axıradək təsdiq edirik. Amma bircə şey bizə qəribə gəlir: Axund buyurur "hanı üləma"? Yə'ni üləma yoxdur. Allah şahiddir ki, elə biz də həmişə bu sözləri yazmışıq və həmişə isbata yetirmişik ki, üləmamız yoxdur və indi hər nə ki görürük, bunlar məhz oyunoyuncaqdır.

Bizə qəribə gələn budur ki, axund cənabları bu sözləri buyurduğu məclisdə qeyr üləma tərəfindən genə gözəl moizələr olunub. Bəs bu nə sözdür ki, "hanı üləma"? Hələ bəs Axund Molla Məhəmməd cənablarına nə deyirsiniz ki, məscidi-camedə nasutdan, məlakutdan, fələkutdan, lahutdan, silsilədən, müəyyiddən danışıblar ( bu qədər də insanda elm olar?)

Amma qorxuram ki, qiyam-qiyamət olanda Məşqətə kəndində aşura günü dəstəbazlıq üstə dava edib "şəhid" olanlar sizin yaxanızdan əl götürmüyələr. İsti otaqda yuxarı başda əyləşib yüz min dəfə eşidilmiş sözləri söyləmək camaatımız üçün bir xidmət deyil.

Hünər budur ki, aşura günü küçələrdə dəstəbazlıq edən "sırf cahil" qardaşlarımızın qabağını kəsib qəmələri və çomaqları alıb atasan dəryaya və Pataqoniya vəhşilərini qoyun sürüsü kimi qaşovluyub aparıb qatasan allahın evinə və minbərə çıxıb deyəsən:

"Üzünüz qara olsun, ey mənim din qardaşlarım ki, imamın tə'ziyəsini həbəşilər yallısına oxşadıb millətlər içində bizi rüsvay elədiniz".

Bu hamının işi deyil. Bu Mirzə Fərəc Pişnamazzadə kimi üləmanın işidir.

**Molla Nəsrəddin**

## TELEQRAF XƏBƏRLƏRİ

**Gəncə** - Şeyx Nizaminin günbədinin tikilməyi üçün Gəncə mollaları öz aralarında beş yüz otuz səkkiz manat on iki qəpik cəm edib banka qoydular.

Gəncəli dövlətli Hacı Həsən söz veribdir ki, üç ibtidai məktəb açsın və xərcini həm öz öhdəsinə götürübdür.

**Gəncə** - Zeynəb xala aşura günü Bala Seyidin şəbih atının altından çox müvəffəqiyyətlə keçdi. Deyirlər, o saat hamilə qaldı.

**Peterburq** - Dövlət Dumasının məşğul olduğu böyük məşğələlərdən biri ki beş toyuğu olana təzə vergi qoyulsun - əksər rə'y ilə qəbul olundu.

**Bakı** - Məşqətə kəndinin mücahidləri aşura günü yalnız baş yarmaq səvabı ilə kifayətlənməyi özləri üçün ar hesab etdiklərindən, məhərrəmliyə hörmətən bir çoxlarının başları ilə bərabər qarınlarını da yardılar.

**Axalsix** - Bura bəyləri qəzet və kitab oxumaqdan vaxt tapa bilmirlər ki, bir az içki içib qumar oynamaqla ürəklərini açsınlar.

**Kazan** - Bu ilə qədər şəhər idarəsində müsəlman üzvləri çox az olmağına görə müsəlmanların dərdinə qalan yoxdu. Amma

həmd olsun, bu il müsəlman üzvləri çoxalıb, müsəlmanların ehtiyaclarına can - quyruqla baxırlar.

**Qarabağ** - Məhərrəm gecələri matəm dəstələri cuşə gəlib arxalarına zəncir yerinə güllələr vururdular.

**Omsk** - Buradakı rus mə'murunun hamısı "iştirakuyyun" əqidəsindədirlər. Bu səbəbə görə yerli qırğızların, türklərin ziraət yerlərini rus mühacirlərinə verirlər ki, hamı bərabər olsun.

**İstanbul** - "Tənin" qəzeti Moskvadan xəbər tutub ki, hamı rus camaatı, xüsusən milli rus firqəsi osmanlılar ilə süd qardaşı olmaq istəyirlər.

**Mərakeş** - Fas əmiri teleqrafla Məhəmmədəli şaha müraciət edib İran məşrutəsinin proqramını istədi.

---

## *MƏTBUAT*

**"Tərəqqi"**

"Məhərrəm günləri" məqaləsində: Ağa Mirməhəmmədkərim ağa xəlayiqi ciddi surətdə ağlatdı.

**MOLLA NƏSRƏDDİN**

Barakallah ağaya! Həqiqət, elə böyük hünər göstərib ki, indiyə qədər heç bir mərsiyəxan bacara bilməmişdi.

**"Tərcüman"**

"Əcaib hallar" məqaləsindən: Fransa xariciyyə naziri parlamentdə əgər demiş olseydi ki, Rusiyada idareyi-keyfiyyə və müstəbidə hökm ediyor, ol vaxt hiddətlənmək lazım gəlir.

**MOLLA NƏSRƏDDİN**

Baba, doğru sözə nə səbəbə hiddət?

**"VƏQT"**

Serbiyalılar osmanlılara acıqlanıb yazırlar ki, Bosnə-Hersəgi niyə pula satdılar.

**MOLLA NƏSRƏDDİN**

Əlbət, nahaq elədilər, gərək böyük qan tökməklə alıb serbiyalılara verəydilər.

**"Tərəqqi"**

"Öz məişətimiz" məqaləsindən: Xristiyan keşişləri elmə böyük xidmət göstərdilər.

**"MOLLA NƏSRƏDDİN"**

Nə şəkk, heç danmaq olarmı ki, Avropada ən əvvəl inkvizisyon akademiyalarını açıb neçə yüz illər xidmət göstərən keşişlər olmuşdur.

---

## *E'LAN*

Gəncədə Bala Seyid məhərrəmdə bir at bəziyibdir. Hansı doğmayan arvad atın qarnının altından keçsə, tezlik ilə doğar. Xahiş edənlər Seyidə rücu' etsin. Hər adamdan bircə manat alınır.

---

## *SUAL-CAVAB*

Məşədi - Axund, kafir kimdir?

Axund Nurə mərsiyəxan - Baş yarmağın götürülməsinə çalışan firəngiməablar.

Məşədi - Nə üçün olar kafirdir?

Nurə - Çünki olar mənə pul vermirlər ki, 400 manatım tamam ola!..

---

## *POÇTA QUTUSU*

.......

Ağdaşda bəhri-təvil sahibinə: Hələ məsləhət bilmədik.

.......

Şuşada "Dost"a: Çox uzundur.

.......

Bakıda "T". cənablarına: 35 qəpik göndər, sənə bir əlifba kitabı göndərim oxu. Bir-iki aydan sora 45 qəpik göndər, bir kitab da göndərim oxu. Elə ki yazmaq öyrəndin - bizə yazdığın əhvalatı bir də yaz göndər ki, oxuya biləK. Vallah, doğru deyirəm.

.......

Ağdamda "Z.M."-ov cənablarına: İnşallah, axırı yaxşı olar, hələ camaat avamdır.

.......

Bakıda "Kəme'tiqad"a: Şe'rlər yaxşıdır, amma bizə əl verən deyil.

.......

Gəncədə "Adı bilməz"ə: Gələcəyi bilmək olmaz.

.......

Sabunçuda Ağa Məhəmməd Əhməd oğlu fəhlənin birindən iki manat almağı barəsində yazana: Doğrusu, sizi tanımırıq və kağızı çap eləmədik.

.......

Ramanıda "Bizəban"a: Ayıbdır, elə sözləri qəzetədə yazmaq olmaz.

.......

Bakıda "Pəjmürdə"yə: Tək səbir gəldi.

.......

İrəvanda "Ustad"a: İnanmıram, Gəncənin "tun" hamamına çata.

---

## *NÜSXƏ*

| | |
|---|---|
| Böyürtkən kötüyü | Qarnıyarıq |
| 1 girvənkə | 5 girvənkə |
| Kabab çini | Balıq yapışqanı |
| 3 girvənkə | 2 girvənkə |

Hər kəs bunları qaynadıb gündə 5 dəfə içsə, heç bir dərd ona yavuq düşməz.

**Şamaxıda təbibi-Haziq**

**Cabbar əmi**

---

## *ƏLİMURAD*

İnsanlar lap xarab olublar: söz və şəmatət, yalan və böhtan dünyanı götürüb.

Yazıq və biçarə divanbəyi Hacı Əlinin adını qoyublar rüşvət alan. Amma and içə bilərəm, cindar

Hacı Mirələkbər Təbrizinin canına ki, bu sözlərin hamısını bir para mərdimazarlar icad eliyiblər.

Divanbəyi Hacı Əlinin rüşvət almağını nə bir adam görüb və nə eşidib. Hər kəs görüb, desin görmüşəm, hər kəs eşidib, desin eşitmişəm.

Bəs elədə o yazığın günahı nədir? Rəvadırmı ki, şahidsiz və sübutsuz mö'təbər bir şəxsin adını nahaq yerə töhmətləndirmək?

O kişi indiyədək nə qədər qulluq edibsə, bircə adama demiyib ki, "mənə rüşvət ver". Ancaq öz əqrəbasından Əlimurad adında bir nəfəri götürüb öz yanında saxlıyır ki, gəlib-gedənin əhvalından xəbərdar olsun və divanbəyinin dolanmaqlığını onlara desin.

İndi divanbəyinin hüzuruna hər kim gəlir, divanbəyi əvvəlcə xəbər alır ki, "Əlimuradı görmüsən?" Hərgah deyə ki, "bəli, görmüşəm", onun sözünə huş və guş ilə qulaq asır. Hərgah dedi ki, "görməmişəm", deyir ki, "əvvəl onu gör, sora gəl".

İndi insaf əhli buyursunlar görək burada divanbəyinin günahı nədir, aya, buna rüşvətmi deyərlər?

**Qasımkənd ləzgiləri**

## MUMİYA

Ozan küçəsinin camaatı bir gecədə mərsiyəxanlarına İmam Hüseyn yolunda üç yüz manat pul yığıb verdilər. Mərsiyəxan nə xan! Alimi-bimisl, fazili-məşhur. Etdiyi moizələr hələ heç bir kitabda görülmüyübdür. Bu moizələri mərsiyəxan cənabları ağıl və məntiq sayəsində özləri ictihad etmişlər. Mərsiyəxan həzrətləri bir xütbəsində belə buyurur:"Camaat! Sizə anlatmaq istəyirəm şiə nədir və sünni nədir? Bir gün Əbubəkr Rizaullah-ənə peyğəmbərin hüzuruna gəlib dedi: "Ya rəsulillah, şiə ilə sünninin təfavütü nədir?" Rəsulillah buyurdular: "Şiə odur ki, gündə on yeddi rük'ət namaz qıla. Amma sünni odur ki, gündə əlli iki rük'ət namaz qıla".

Molla əmi! İttihadi-islama çalışan bu vücudu sizdən təvəqqə edirəm oxucularınıza təqdim edəsiniz: İsmi-şərifi Molla Yusif qubalıdır, dünyaya gələli əlli ildir, amma on beş yaşındadır, çünki iyirmi yaşınadək baliğ olmuyub, yə'ni ağlı başında olmuyub və yerdə qalan otuz ilin yarısı gecə olub, yarısı gündüz, gecə də yaşa hesab deyil. Heykəli ingilis muzeylərində olan Misri-qədim mumiyalarına bənzəyir. Anadan olub yə'cuc-mə'cucstanda və yainki Qubada. Nə vaxt təvəllüd edib və nə vaxt vəfat edəcək, mə'lum deyil.

**Qarın**

## XƏTA

Məhərrəmül-həram ayının on birində xas axşamı Gəncədə məşhur "vasvası" Molla Məhəmmədbağırın paltarı məsciddə bir müsəlmanın paltarına dəymiş, qış vaxtı olduğundan biçarə özünü suya ata bilməmişdir. Bə'zi rəvayətə görə məsciddən çıxan kimi Molla Məhəmmədbağır hamama gedib paltara qüsl etmişdir və bə'zi rəvayətə görə paltarı hiyleyi-şər'i edib paka çıxartmışdır. Xülaseyi-kəlam, iş uzundur, görək bu barədə paytaxt qəzetələri nə yazacaq.

**Qarın**

## SUAL-CAVAB

Sual: - Acı yağlar nəyə işləndi?

Cavab: - Ehsan plovlarına.

Fəqir qonşular nə gözlədilər? Plov. Haradan? Təkyələrdən. Nə bildilər? İyisi gedirdi. Hara? Yetimlərin, dul arvadların damağlarına. Yolladılarmı? Nəmənə? Plov. Kimə? Belə bunlara. Bunlar nə cür adamdırlar? Müstəhəq. Ehsan verilən yerdə müstəhəq adamlar da var idi. Nə bildilər? Qabaqdan qayıdandan hərəsi bir düyü.

**Dəngəsər**

## MOLLA İBRAHİM

Hər kəs cəmi müsəlman kəndlərini çapıb-talamaq istəsə ya gərək quldur olsun, ya gərək Gəncənin Qazaklar kəndindəki topal, gödək Molla İbrahim kimi həmi cindarlıq eləsin, həmi duanəvis olsun, həm də həkim olsun: Surx bad, səfid bad, siyah bad, kobud bad - nəmənə bad dualarının hamısını bilsin və ona da əlac eləsin. Baqi səlaməti-şüma əst.

**Müxlisiniz: Keyfsiz Kamal**

Müdir və baş mühərrir:
Cəlil Məmmədquluzadə.

## E'LANLAR





## İDARƏMIZDƏ SATILAN KITABLAR

| Kitabların adları | Yazanlar | Qiymətləri | |
|---|---|---|---|
| | | idarədən | poçta xərci ilə |
| Dərs kitabları: Vətən dili, əvvəlinci il üçün dərs kitabı | Çernyayevski | 35 qəp. | 40 qəp. |
| Türk əlifbası | Müəllim M.Mahmudbəyov | 20 qəp. | 24 qəp. |
| Birinci kitab, əvvəlinci il üçün dəsr kitabı | Gəncə müəllimi Mirzə Abbas Mollazadə | 20 qəp. | 24 qəp. |
| Uşaq bağçası, birinci il üçün dəsr kitabı | Rəşidbəy Əfəndizadə | 25 qəp. | 30 qəp. |
| Bəsirətül-ətfal, ikinci il üçün dəsr kitabı | -*-*-*- | 25 qəp. | 30 qəp. |
| Məşq məcmuəsi | Mirzə Abbas Mollazadə | 8 qəp. | 10 qəp. |
| Qiraət kitabları: Təşrihül-fəraiz | Axund Araszadə | 1 man. | 1man. 16 qəp. |
| "Rüstəm və Söhrab" (gözəl şəkilli) | Abbas Ağa Qayıbov | 1 man. | 1man. 20 qəp. |
| Bizə hansı elmlər lazım | Axund Əbuturab mərhum, Ə.Hüseynzadə, Faiq Ne'manzadə və Molla Nəsrəddin | 15 qəp. | 20 qəp. |
| Usta Zeynal (şəkilli) | Molla Nəsrəddin | 15 qəp. | 17 qəp. |
| Qurbanəlibəy (-*-) | -*-*-*- | 15 qəp. | 17 qəp. |
| İranda hürriyyət (-*-) | -*-*-*- | 15 qəp. | 17 qəp. |
| Millət dostları | Haqverdiyev | 5 qəp. | 7 qəp. |
| Şeyx və vəzir və mübdeyi-tərəqqi (farsca) | Mirzə Mülkümxan | 20 qəp. | 24 qəp. |
| Məbdəüd-tərəqqi (farsca) | -*-*-*- | 5 qəp. | 7 qəp. |
| Həqiqəti-islam | Axund Yusif Talıb-zadə | 50 qəp. | 50 qəp. |
| İslam tarixi (birinci hissə) | -*-*-*- | 45 qəp. | 45 qəp. |
| İslam məmləkətlərinin xəritəsi | -*-*-*- | 45 qəp. | 25 qəp. |
| Müəllimüş-şəriə (birinci hissə) | -*-*-*- | 40 qəp. | 40 qəp. |
| Müəllimüş-şəriə (ikinci hissə) | -*-*-*- | 50 qəp. | 50 qəp. |
| İki uşaq | Mirzə Abdulla Talıb-zadə | 20 qəp. | 20 qəp. |
| Qanlı müsadimə | -*-*-*- | 5 qəp. | 5 qəp. |

*Şagird dəftərləri: idarədə yüz dənəsi 2 manat 40 qəpik.*

## E'LAN

1. "Hesab məsələsi" (Задачникъ). Bu kitab məktəblərdə və evlərdə hesab tə'limi üçün tərtib olunub 761 hesab məsələsini, 237 tə'limati-rəqəmiyyəyi və Rusiyada iste'mal olunan ölçüləri və ölçülərə dair tə'limləri havidir. Qiyməti 35 qəpikdir.

2. Gündəlik dərsləri yazmaq üçün yövmiyyə dəftəri (Дневникъ).

Şagirdlərə gündəlik, həftəlik, aylıq və illik nömrələr qoymaq və dərsləri yazmaq üçün cədvəlləri və bə'zi digər mə'lumatı havidir. Qiyməti 30 qəpik.

Bu kitabları almaq istəyən müəllimlərə və kitabçılara böyük təfavüt qoyulacaqdır. Ən ədəddən əskiyinə poçta markaları qəbul olunur. Xahiş edənlərə naloj ilə göndərilir.

Adres: Gəncədə Həmidbəy Yusifbəyova, yaxud Məktəbi-ruhani kitabxanasına.

ÇAY QƏDRİ BİLƏNLƏR DİQQƏT ETSİNLƏR
ƏN Ə'LA ÇAY

Moskvada Vısotski və kampaniyasının çay şirkəti
**Т-ва чайной торговли В.Высоцкий и К°. Москва.**
Sərmayəsi 10.000000 manatdır. İldə 40.000000 manatlıq ticarət eliyir. Yaxşılığı səbəbindən bizim şirkətin çayı nəhayət dərəcədə çox işlənir və bizim şirkət kimi heç kəs o qədər mal satmır. Çayımız çox rəngli və ətirlidir və bir dəfə imtahan üçün çayımızı içən həmişəlik müştərimiz olur. Ticarət nişanəmiz də həmişəki kimi olmağına diqqət eləmək lazımdır. Zaqafqaziya, Zakaspiya və İran üçün şö'bəmiz Tiflisdə Puşkin küçəsində nömrə 7-dir. Telefon nömrə 632.

Тифлисъ, Пушкинская ул., №7. Телефонъ № 432.

   

1865 г. 1870 г. 1882 г. 1896 г.

Rus və Amerika rezin manufakturasının şirkəti
Firması "TRİUQOLNİK"
(yə'ni Üçguşəli)
Peterburqda
Karxana şeyləri.
Çəkən rezin qayışları.
Rezindən və pinkadan qayrılmış qollar.
Azbestdən kartoni şeylər.
Azbest kartoni.
Cərrah və təbabət şeyləri.
Örtüklər və paltolar.
Rezinlənmiş parçalar.
Velosiped şinləri və hissələri.
Rezin oyuncaqları.
Toplar.
Rezin naboykaları.
Qaloşlar.
Hər qisim rezin şeyləri
və "buynuz" rezinindən qayrılmış şeylər.

1860
Т.Р.А.Р.М.
С. ПЕТЕРБУРГЪ

Təvəqqə edirik hər bir sifarişləri göndərmək

**"LEOPOLD NEYŞELLERİN"**

ticarətxanasına.

въ торговый домъ
"ЛЕОПОЛЬДЪ НЕЙШЕЛЛЕРЪ"

Тифлисъ. Эриванская площ., домъ Кредитнаго Общества.

Tiflis. İrəvanskaya ploşad, Kreditnaya Obşestvanın evində.

Xahiş edənlərə preyskurant tə'xirsiz göndərilir.

ПРЕЙСЪ-КУРАНТЫ ПО ПЕРВОМУ ТРЕБОВАНИЮ ВЫСЫЛАЮТСЯ

Qafqaz mə'dən  sularının idarəsi

Müştərilərə xəbər verir ki, Tiflisdə idarə tərəfindən Qafqaz təbii mə'dən sularının skladı (anbarı) açılıbdır.
Narzan və Yessentuki, nömrə 20
Tiflis: Dvortsov küçəsində, Saracevin imarətində.
Rossiya Transport və Straxovoy cəmiyyətinin kantorasında.
Telefon nömrə 148.
Дворцовая улица, домъ Сараджева, Контора Россiйскаго Транспортнаго и Страхового Общества. Телефонъ №148.
Anbarda qiymətləri:
Vaqon ilə (120 yeşik) - hər yeşiyi 11 manat 80 qəpik.
Yeşik ilə (100 yarımbutulka) - hər yeşik 12 manat 30 qəpik.
Və yarımbutulkalar ilə - hər biri şüşəsi ilə 14 qəpik.
Direktor S.Teleçeyev

**Badkubədə Mehmanxaneyi - "İslamiyyə"**
**Гостиница "ИСЛАМИЯ" въ гор. БАКУ.**
**Nömrələrinin qiyməti 1 manatdan beş manata qədərdir və aşpazxanamızda hər cür Asiya və Avropa xörəkləri mövcuddur. İstirahətini sevən müştərilərdən mehmanxanamızı bir dəfə gəlib görmələri rica olunur. Adresimiz: Qubernski küçədə, Lalayevin evində Mehmanxaneyi-"İslamiyyə".**
**Sahibi-mehmanxana: İsmayıl Mahmudzadə.**
**Баку, Губернская ул. номера "ИСЛАМИЯ", телефон 1251.**

IV ГОДЪ ИЗДАНIЯ № 5 ФЕВРАЛЯ 1-ГО 1909г.

# “Молла Насреддинъ”

*КОНТОРА и РЕДАКЦIЯ*
журнала
“Молла Насреддинъ”
Тифлисъ,
*Давидовская ул., д.24*

ЕЖЕНЕДЕЛЬНЫЙ
ПОЛИТИКО-САТИРИЧЕСКIЙ и
ХУДОЖЕСТВЕННЫЙ ЖУРНАЛЪ

*ЦѢНА на ГОДЪ*
*Съ доставкою..............5 руб.*
*За границу.....................6 руб.*
*ЦѢНА за ОБЪЯВЛЕНIЯ*
*За место занимаемое строкою*
*петита впереди текста ......10 коп.*
*позади " " " ......7 коп.*

“Molla Nəsrədin”in əvvəlinci və üçüncü ilinin cildlənmiş kitabları və boş cildləri satılmaqdadır. Cildlərin üstündə Mollanın şəkli və adı, məcmuənin tarixi qızıl vərəq ilə basılıbdır. Qiymətləri idarədə: əvvəlinci ili 6 manat, üçüncü ili - 6 manat yarım, boş cildi - 70 qəpik, poçta xərci ilə: əvvəlinci ili - 6 manat yarım, üçüncü ili - 7 manat, boş cildi bir manat.

İkinci ilin kitabları bu yavuq vaxtlarda hazır olacaq.




- Haramzadalar, imam ehsanı sizdən ötrü deyil ki, gəlib buraya soxulubsunuz...




Bakıda Maştağa kəndində aşura günü